**ƏLİXAN MUSAYEV**

**MƏXLUQATIN ƏN XEYİRLİSİNİN (s.ə.s)**

**KƏLAMLARINDAN GÖTÜRÜLMÜŞ**

# HÖKMLƏRİN ƏSASI

Abdul-Ğani əl-Məqdisi

Birinci cild

**«Ey Rəbbim! Köksümü açıb genişlət;**

**İşimi yüngülləşdir;**

**Dilimdəki düyünü aç ki,**

**Sözümü yaxşı anlasınlar!»**

**(TA HA, 25-28)**

# TƏRCÜMƏÇİNİN ÖN SÖZÜ

Şükür və tərif Allaha məxsusdur, biz Ona şükür edir, Onu tərif edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma diləyirik, nəfslərimizdəki şərdən, əməllərimizdəki pisliklərdən qorunmaq üçün Allaha sığınırıq. Allahın haqq yoluna yönəltdiyi şəxsi azdıran, azdırdığı şəxsi isə haqq yoluna yönəldən tapılmaz. Şəhadət edirəm ki, Allahdan başqa ibadət haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şəhadət edirəm ki, Məhəmməd (s.ə.s) Onun qulu və elçisidir.

Müsəlman qardaş və bacılarımın istəyini nəzərə alıb şəriət hökmləri ilə bağlı hədislər toplusundan ibarət olan bu kitabı tərcümə etmək qərarına gəldim.

Bu kitabın haşiyəsində yazılan bəzi kəlmələrin izahı, İbn Həcər əl-Əsqəlaninin «Səhihu-l-Buxari»yə və ən-Nəvəvinin «Səhih Müslim»ə verdiyi şərhdən, həmçinin hədislərdən çıxarılan nəticələr də bu mənbələrdən və bir də Abdullah ibn Əbdürrəhman ibn Saleh Əli Bəssəmin bu kitaba verdiyi şərhindən götürmüşəm.

Fiqhi məsələlərlə bağlı olan bəzi rəylər isə Məhəmməd ibn Saleh əl-Üseyminin ictihadı nəticəsində (islam alimlərinin icması[1] və onların əsaslandığı dəlilləri nəzərə alaraq) verdiyi rəylərdir.

Hədislərin mənbələri kitabın əslində olmadığı üçün onların hansı mənbədən götürüldüyünü müəyyən edib kitaba əlavə etmişəm. Bu əlavələr hədislərin sonunda mötərizə içərisindədir.

Quran ayələrinin tərcüməsini isə Ziya Bünyadov və Vasim Məmmədəliyevin tərcümə etdikləri Qurandan bilavasitə götürmüşəm.

Kitab 426 hədis və 20 bölmədən ibarətdir, hər bölməyə də müxtəlif sayda fəsillər daxildir.

Bundan əlavə, hər bölmənin sonunda onun xülasəsi də verilmişdir.

---

[1] Əbu Hənifə, Malik ibn Ənəs, Məhəmməd ibn İdris əş-Şafii, Əhməd ibn Hənbəl və başqaları.

## Fiqh haqqında anlayış

**Fiqh kəlməsinin lüğəti mənası:** Anlama, başa düşülmə deməkdir.

**İstilahi (şəriət baxımından) mənası:** Quran və Peyğəmbərin (s.ə.s) sünnəsindəki (hədislərindəki) dəlillərdən çıxarılan şəriət hökmləri ilə bağlı olan elm.

**Mövzusu:** Fiqh – ibadət və s. şəriət hökmləri haqqında bəhs edən elmdir.

**Səmərəsi:** Bu elm hər bir müsəlmana ibadətləri düzgün yerinə yetirməyə, bununla da dünya və axirətdə səadətə qovuşmağa kömək edir. Peyğəmbər (Ona və ailəsinə Allahın xeyir-duası və salamı olsun! – səlləllahu əleyhi və səlləm – s.ə.v.) demişdir: «Uca Allah xeyir istədiyi bəndəsini dində fəqih[1] edir» (Müslim, 4933-cü hədis).

**Hökmü:** Bu elmə yiyələnmək fardu-l-kifayədir[2]. Uca Allah buyurur:

وَمَا كَانَ الْمُؤْمِنُونَ لِيَنْفِرُوا كَافَّةً فَلَوْلَا نَفَرَ مِنْ كُلِّ
فِرْقَةٍ مِنْهُمْ طَائِفَةٌ لِيَتَفَقَّهُوا فِي الدِّينِ وَلِيُنْذِرُوا قَوْمَهُمْ إِذَا رَجَعُوا
إِلَيْهِمْ لَعَلَّهُمْ يَحْذَرُونَ ﴿١٢٢﴾

«[Ehtiyac olmadıqda] möminlərin hamısı birdən [cihada, döyüşə] çıxmamalıdır. Barı hər tayfadan bir dəstə [dini elmləri öyrənmək, sonra da din qardaşlarına öyrətmək üçün] qalsınlar ki, camaatı [döyüşdən] qayıtdığı zaman onları [Allahın əzabı ilə] qorxutsun. Bəlkə, onlar (əldə etdikləri biliklər sayəsində yaramaz işlərdən, nalayiq hərəkətlərdən) çəkinsinlər!» (ət-Tövbə, 122).

## Şəriət hökmlərinin növləri

**Vacib:** Buna əməl edən savab qazanır, onu tərk edən isə əzaba düçar olur. Bura namaz, oruc və s. kimi əməllər daxildir.

**Haram:** Bunu tərk edən savab qazanır, əməl edən isə əzaba düçar olur. Bura zina, oğurluq və s. kimi əməllər daxildir.

---

[1] Quran və hədislərə əsaslanaraq bir çox şəriət hökmlərindən anlayışı olan şəxs.

[2] Fardu-l-kifayə: bir və ya daha çox müsəlmanların yerinə yetirməsi ilə digərləri üçün vacib olmayan əmələ deyilir.

**Müstəhəb:** Buna əməl edən savab qazanır, onu tərk edən isə əzaba düçar olmur. Bura Aşura gününün orucu və s. kimi əməllər daxildir.

**Məkruh:** Bunu tərk edən savaba nail olur, əməl edən isə əzaba düçar olmur. Bura məscidə sol ayaqla daxil olmaq və s. kimi əməllər daxildir.

**Mübah:** Buna əməl edən və ya onu tərk edən nə savab qazanır, nə də ki əzaba düçar olur.

Bu kitabın tərtib olunmasında kömək göstərmiş bütün müsəlman qardaşlarıma öz təşəkkürümü bildirirəm.

Bu tərcümənin nöqsanlardan və xətalardan xali olmadığı üçün, bu barədə qeyd və mülahizələrini bildirəcək oxuculara əvvəlcədən təşəkkür edirik. Onların dəyərli məsləhətləri bu kitabın gələcək nəşrlərində nəzərə alınacaqdır.

*Tərcüməçidən*

# MÜQƏDDİMƏ

Şeyx Əbu Məhəmməd abdul-Ğani ibn abdul-Vahid ibn Ali ibn Surur əl-Məqdisi (Allah ona rəhm etsin!) dedi: «əl-Məlik, əl-Cabbar, əl-Vahid, əl-Qahhər olan Allaha həmd olsun! Şəhadət verirəm ki, tək olan, heç bir şəriki olmayan Allahdan başqa ibadət olunacaq məbud yoxdur. Göylərin, yerin və onların arasında olanların Rəbbi əl-Əziz, əl-Ğaffardır, və şəhadət verirəm ki, Məhəmməd Onun seçilmiş qulu və elçisidir. Ona, onun ailəsinə və xeyirxah səhabələrinə Allahın salavatı və salamı olsun!

Bəzi müsəlman qardaşlarım şəriət hökmlərinə dair iki imamın – Əbu Abdullah Məhəmməd ibn İsmail ibn İbrahim əl-Buxari və Müslim ibnu-l-Həccac ibn Müslim əl-Quşeyri ən-Nisaburinin, üzərində müttəfiq olduğu hədisləri müxtəsər şəkildə yazmağı məndən xahiş etdilər. Onların xahişini nəzərə alıb fayda vermək üçün bu kitabı yazıram.

Allahdan istəyirəm ki, bu kitabı yazanı, oxuyanı, əzbərləyəni, onun haqqında eşidəni və ona nəzər salanı onunla faydalandırsın, bu əməli Kəramətli Allah xatirinə olunan xalis əməllərdən etsin və bununla da Onun yanında nicat tapanları Nəim cənnətlərinə yetişdirsin. Həqiqətən, O, bizə bəs edər. O, nə gözəl vəkildir!

*Müəllifdən.*

## əl-Buxarinin tərcümeyi-halı[1]

Adı: Məhəmməd ibn İsmail ibn İbrahim ibni-l-Muğirə ibn Bərdizbə əl-Cufi.

Künyəsi: Əbu Abdullah.

Təvəllüdü: hicrətin 194-cü ilində şəvval ayının 13-ü Buxara şəhərində anadan olmuşdur.

O, uşaq ikən kor olur. Anası gecə-gündüz oğlu üçün dua edir və Uca Allah onun görmə qabiliyyətini qaytarır. Anası hicrətin 210-cu ilində onu və qardaşı Əhmədi Həccə aparır və hədis elminə olan həvəsinə görə onu Məkkə şəhərində qoyub gedir. Tarixçilər qeyd edirlər ki, o zaman əl-Buxari artıq yetmiş min hədis əzbər bilirdi.

Artıq 18 yaşında o «Tarix» kitabını yazır. Sonralar hədisləri toplamaq üçün o Şam, Misir, Bəsrə, Hicaz, Kufə, Bağdad və bir çox başqa yerlərə səyahət edir.

Onun haqqında deyilənlərdən:

İbn Kəsir demişdir: «O, bir dəfə kitaba baxmaqla (oxumaqla) onu əzbərləyərdi».

İbn Mücahid demişdir: «Məhəmməd ibn Səlləmin yanında idim. O mənə dedi: – Bir az əvvəl gəlmiş olsaydın, sənə yetmiş min hədis əzbər bilən uşağı göstərərdim».

Quteybə ibn Səid demişdir: «Fəqihlərlə, zahidlərlə və abidlərlə oldum, lakin Məhəmməd ibn İsmail kimisini görmədim. O, öz zamanında Ömər (r.a.) kimi idi».

Tirmizi demişdir: «Sənəd[2] və iləl[3] elmində Məhəmməd ibn İsmail kimisini görmədim».

Əsərləri:

1. «əs-Səhih». Kitabın tam adı: «əl-Cəmiu-s-səhih əl-musnəd min hədisi rasulilləhi sallallahu aleyhi və səlləmə və sunənihi və əyyamihi».
2. «Əsami-s-səhabə»
3. «ət-Tarixu-l-kəbir»
4. «ət-Tarixu-l-əvsat»
5. «ət-Tarixu-s-sağir»
6. «Qadayə-s-səhabə və-t-tabiin»

---

[1] Məlumatlar «Səhihu-l-Buxari»nin şərhinin müqəddiməsindən götürülmüşdür.

[2] Hədisin mətninə qədər sadalanan ravilərin (yəni hədisi rəvayət edən kəslərin) silsiləsinin araşdırılması.

[3] Hədisin sənədində və ya mətnində olan və onu zəiflədə biləcək amillərin araşdırılması.

7. «əl-İləl»
8. «əl-Kunə»
9. «Birru-l-valideyn»
10. «əl-Məbsut»
11. «ət-Təfsiru-l-kəbir»
12. «əl-Musnədu-l-kəbir»
13. «Cuzu rafu-l-yədeyn fi-s-saləti»
14. «Cuzu-l-qiraəti xalfə-l-iməmi»
15. «Xalqu əfali-l-ibəd».

Vəfatı: Hicrətin 256-cı ilində şəvval ayının 1-i, Fitrə bayramının gecəsi Səmərqənddə vəfat etmişdir.

Buxari «əs-Səhih» əsərini iki əsas səbəbə görə yazmışdır:

– O rəvayət edir ki, biz İshaq ibn Rəhavyanın yanında idik. O bizə dedi: «Yaxşı olardı ki, Peyğəmbərin (s.ə.s) sünnəsi barəsində səhih kitab tərtib edəsiniz». Onun təklifi çox xoşuma gəldi və «əl-Cəmiu-s-səhih» kitabını tərtib etməyə başladım.

– O rəvayət edir ki, bir dəfə mən Peyğəmbəri (s.ə.s) yuxuda gördüm. Əlimdəki yelpiklə onu yelpikləyir və üzərinə qonan milçəkləri ondan uzaqlaşdırırdım. Alimlərdən gördüyüm yuxu barəsində soruşduqda onlar mənə dedi ki, sən Peyğəmbərin (s.ə.s) adından istifadə olunaraq uydurulan rəvayətləri ondan uzaqlaşdıracaqsan. Bu da mötəbər hədisləri cəm etməyim üçün bir səbəb oldu.

Kitabı tərtib etdiyi üsul:

Əl-Buxari demişdir: «Mən "əl-Cami" əsərində olan hədisləri on altı il ərzində, altı yüz min hədisin içərisindən seçib tərtib etdim».

O həmçinin demişdir: «Mən hər bir hədisi bu kitaba yazmamışdan əvvəl yuyunub iki rükət namaz qılardım».

Hədisin mötəbərliyini təsdiq etmək üçün qoyduğu şərtlər:

1. Sənəddə olan bağlılıq. Yəni sənədin əvvəlindən (hədisi rəvayət edən şəxsdən) axırına (səhabələrə) qədər olan ravilər hədisi biri-birindən (hər biri hədisi ona rəvayət edən şəxsdən bilavasitə) eşitməlidir.

2. Ravilərin ədalətli olması. Yəni hər bir ravi həddi-büluğa çatmış, şüurlu, Allah və Onun elçisinə müti olan, əxlaqlı müsəlman olmalıdır.

3. Ravilərin mühafizəkarlığı. Yəni hər bir ravi eşitdiyi hədisi olduğu kimi qəlbində (əzbərdən) və ya yazılı şəkildə (dəyişdirilməməyi üçün) mühafizə etməlidir.

4. Rəvayətlər arasında ziddiyyətin olmaması. Yəni hər hansı bir ravinin rəvayət etdiyi hədis başqa ravilərin və ya ondan da üstün olan ravinin rəvayət etdiyi hədisə zidd olmamalıdır.

5. Rəvayətdə illənin olmaması. Yəni hədisin mətnində və ya sənədində onu zəiflədən amil olmamalıdır.

6. Eyni əsrdə yaşamaq. Yəni hər bir ravi hədisi ona rəvayət edən şəxslə eyni əsrdə yaşamalıdır.

7. Rastlaşma. Yəni hər bir ravi hədisi ona rəvayət edən şəxslə bir dəfə də olsa belə rastlaşmalıdır.

## Müslimin tərcümeyi-halı[1]

Adı: Müslim ibnu-l-Həccac ibn Müslim ibn Vard əl-Quşeyri ən-Nisaburi.

Künyəsi: Əbu-l-Hüseyn.

Təvəllüdü: Müslim hicrətin 204-cü ilində Nisabur şəhərində anadan olmuşdur.

Uşaq ikən hədis elmini çox sevirdi. Təhsilini ilk dəfə yaşadığı şəhərdə olan alimlərdən mənimsəmişdir. Sonralar o, Peyğəmbərin (s.ə.s) hədislərini toplamaq üçün İraq, Şam, Misir, Hicaz, Xorasan, Bağdad və bir çox başqa yerlərə səyahət etmişdir.

Onun haqqında deyilənlərdən:

Əbu-l-Fadl Əhməd ibn Sələmə demişdir: «Mən Əbu Zura və Əbu Hatimin Müslimə qarşı olan münasibətini gördüm. Onlar hədis elmində Müslim ibnu-l-Həccacı əsrinin alimlərindən üstün sayırdılar».

Əbu Qüreyş demişdir: «Dörd hafiz mövcuddur: bunlar Əbu Zura, Məhəmməd ibn İsmail, əd-Dərimi və Müslimdir».

Məsləmə ibn Qasim demişdir: «O, mötəbər hafizlərdən olub, hədis elmindən çox anlayışı var idi».

Xəlili demişdir: «Onun fəzilətlərini qeyd etməyə ehtiyac yoxdur. Çünki, o, bundan da artıq məşhurdur».

Əsərləri:

1. «əs-Səhih». Kitabın tam adı: «əl-Musnədu-s-Səhih»dir.
2. «ət-Tabəqat».
3. «əl-Əsma va-l-kunə».
4. «ət-Təmyiz».
5. «əl-Münfəridətu-l-vihdən».
6. «Suələtu-l-imam Əhməd».
7. «Əvhami-l-muhəddisin».
8. «Əvlədi-s-sahəbə».
9. «Əfradi-ş-şamiyyin».
10. «əl-Əqran».
11. «Məşəyix Malik».
12. «Məşəyix Şöbə».
13. «Məşəyixu-s-Səuri».

[1] Məlumatlar «Səhih Müslim»in şərhinin müqəddiməsindən götürülmüşdür.

14. «əl-Muxadramin».
15. «əl-İntifa bi uhubi-s-siba».

Vəfatı: Müslim hicrətin 261-ci ilində Rəcəb ayının 2-si Nisabur şəhərində vəfat etmişdir.

O, bu kitabı bir əsas səbəbə görə yazmışdır. Belə ki, tələbələrindən biri[1] ondan səhih hədisləri bir kitabda cəm etməsini xahiş edir. Müslim onun bu xahişini nəzərə alıb «əl-Musnədu-s-Səhih» əsərini tərtib edir.

Hədisin mötəbərliyini təsdiq etmək üçün qoyduğu şərtlər:
1. Sənəddə olan bağlılıq. Yəni sənədin əvvəlindən (hədisi rəvayət edən şəxsdən) axırına (səhabələrə) qədər olan ravilər biri-birindən (hər biri hədisi ona rəvayət edən şəxsdən bilavasitə) eşitməlidir.
2. Ravilərin ədalətli olması. Yəni hər bir ravi həddi-büluğa çatmış, şüurlu, Allah və Onun elçisinə müti olan, əxlaqlı müsəlman olmalıdır.
3. Ravilərin mühafizəkarlığı. Yəni hər bir ravi eşitdiyi hədisi olduğu kimi qəlbində (əzbərdən) və ya yazılı şəkildə (dəyişdirilməməsi üçün) mühafizə etməlidir.
4. Rəvayətlər arasında ziddiyyətin olmaması. Yəni hər hansı bir ravinin rəvayət etdiyi hədis başqa ravilərin və ya ondan da üstün olan ravinin rəvayət etdiyi hədisə zidd olmamalıdır.
5. Rəvayətdə illənin olmaması. Yəni hədisin mətnində və ya sənədində onu zəiflədən amil olmamalıdır.
6. Eyni əsrdə yaşamaq. Yəni hər bir ravi hədisi ona rəvayət edən şəxslə eyni əsrdə yaşamalıdır.

[1] Xətib əl-Bağdadi «Tarixu-l-Bağdad» əsərində (4-cü cild, 186-cı səhifə) bu tələbənin Əhməd ibn Sələmə ən-Nisaburi olduğunu qeyd etmişdir.

## BİRİNCİ BÖLMƏ: «TƏHARƏT»

1. Ömər ibnu-l-Xəttab (Allah ondan razı olsun! – radıyallahu anhu – r.a) dedi: «Rəsulullahın: "Əməllər niyyətlərə görədir və hər bir kəsin etdiyi əməl niyyəti ilə ölçülür[1]. Kimin hicrət etməsi Allah və Onun rəsulu (onun buyuruğunu yerinə yetirmək) üçündürsə, onun hicrəti (etdiyi hər bir əməl) Allah və Onun rəsulu (onun razılığını qazanmaq) üçündür[2]. Kimin ki, hicrəti dünyaya nail olmaq və ya qadınla evlənmək üçündürsə, onun hicrəti niyyət etdiyində tamamlanır[3]" – dediyini eşitdim» (əl-Buxari, 1; Müslim, 4904).

Niyyət: lüğəti mənası – qəsd etməkdir. İstilahi mənası – qəlbi hər hansı bir əməli etməyə və ya ondan çəkinməyə yönəltməkdir.

Hicrət: lüğəti mənası – tərk etməkdir. İstilahi mənası – Allahın qadağan etdiyi şeyləri tərk etməkdir.

Hicrət iki qisimdir: 1) Təhlükəli yerdən əmin-amanlıq olan yerə hicrət; 2) Küfr olan yerdən iman olan yerə hicrət.

1-ci hədisdən çıxarılan nəticələr:

– Niyyət ibadətdir. Buna görə də möminin hər ibadət üçün niyyət etməsi vacibdir;

– Hədisin əvvəli əməllərlə, axırı isə əməllərin cəzası ilə bağlıdır;

– Niyyət əməlin qəbul olması üçün şərtdir;

– Niyyətin yeri qəlbdir. Hər hansı ibadəti etdikdə niyyəti tələffüz etmək yenilikdir. Yalnız həcc və ümrə üçün olunan niyyət müstəsnadır. Bu iki ibadət növündə niyyət tələffüz olunur;

– Allah xatirinə şirk və küfr olan ölkədən İslam ölkəsinə olunan hicrət əfzəl ibadətlərdəndir;

– Dünya və qadın xatirinə olunan ibadət riyakarlıq sayılır.

2. Əbu Hureyra (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Sizdən birinizin dəstəmazı pozulduqda dəstəmaz almayınca Allah onun (dəstəmazsız qıldığı) namazını qəbul etməz» (əl-Buxari, 6954; Müslim, 536).

2-ci hədisdən çıxarılan nəticələr:

– Dəstəmazsız qılınan namaz qəbul olunmur;

– Dəstəmazı batil edən amil namazı da batil edir;

---

[1] Günah və ya savab qazanır.

[2] Onun savabını Allah verir.

[3] İstədiyinə yalnız bu dünyada nail olur.

– Dəstəmaz namazın şərtlərindəndir;
– Səhvən dəstəmazsız qılınan namaz təkrar qılınmalıdır.

3. Abdullah ibn Amr ibnu-l-As (r.a), möminlərin anası Aişə (r.a)[1] və Əbu Hüreyrə (r.a) rəvayət edirlər ki, Peyğəmbər (s.ə.s) bir nəfərin dəstəmaz alıb dabanlarını tam yumadığını görüb dedi: «Vay olsun cəhənnəmdə yanan dabanlara!» (əl-Buxari, 60; Müslim, 565, 571, 572).

3-cü hədisdən çıxarılan nəticələr:
– Dəstəmaz alarkən yuyulması vacib olan əzaların tam isladılması;
– Dəstəmazı tam şəkildə almayanın əzaba düçar olması;
– Ayaqların yuyulmasının vacib olması.

4. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Sizdən biriniz dəstəmaz aldıqda suyu burnuna alıb sonra onu burnundan kənar etsin, ayaqyolunda təharət etdikdə tək sayda təmizlənsin. Sizdən biriniz yuxudan oyandıqda dəstəmaz alacağı qaba əlini salmazdan əvvəl əllərini üç dəfə yusun, çünki o, əlinin nəyə toxunduğunu bilmir» (əl-Buxari, 162; Müslim, 559, 560, 561).

4-cü hədisdən çıxarılan nəticələr:
– Dəstəmaz alınan zaman buruna su almağın vacib olması;
– Ayaqyolunda tək sayda təmizlənmənin müstəhəb olması;
– Yuxudan oyanana əllərini qaba salmazdan öncə (əllərini) üç dəfə yumasının müstəhəb olması;
– Yuxunun dəstəmazı pozan amil olması.

5. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Sizdən biriniz daimi bir yerdə duran (durğun) suya sidik ifraz edib sonra həmin su ilə yuyunmasın» (əl-Buxari, 239; Müslim, 654).
Əbu Hüreyrənin başqa bir rəvayətində deyilir ki, Peyğəmbər (s.ə.s) dedi: «Sizdən biriniz cənabət[2] halında olduqda daimi bir yerdə duran suda yuyunmasın» (Müslim, 656).

5-ci hədisdən çıxarılan nəticələr:
– Daimi bir yerdə olan suya sidik ifraz etməyin qadağan olması;

---

[1] Uca Allah buyurur: «Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır. Onun zövcələri möminlərin anasıdır» («əl-Əhzab», 6).
[2] Cinsi əlaqədən və ya hər hansı yolla məni ifraz edilməsindən sonrakı hal.

– Sidik ifraz olunmuş sudan dəstəmaz və qüsl üçün istifadənin qadağan olunması (Axar su isə müstəsnadır);
– Sidiyin suya ifraz edilməsinin ədəbsizlik olması.

6. Əbu Hüreyrə rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «İt, sizdən birinizin qabından (su və s.) içərsə, o qabı yeddi dəfə yuyun!»
Müslimin əlavəsində: «Birincisini torpaqla[1]» (əl-Buxari, 172; Müslim, 648, 649).

7. Abdullah ibn Muğaffəl (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) üzr: «İt, sizdən birinizin qabını yalayarsa, o qabı yeddi dəfə yuyun və səkkizincini torpaqlayın[2]» (Müslim, 651).

6-cı və 7-ci hədislərdən çıxarılan nəticələr:
– İtin murdar sayılması;
– İtin yaladığı (və ya içdiyi) qabın yeddi dəfə yuyulmasının vacib olması;
– Qabın yuyulmasında torpağın istifadə edilməsinin vacib olması;
– İslam dininin bu cür əzəmətli şəriət qanunlarına və təmizliyə riayət etməsi;
– Ov iti, çoban iti (mal-qaranı qoryuan) və həyət-bacanı qoryuan itlərin müstəsna olması.

8. Osman ibn Əffanın mövlası Humran rəvayət edir ki, Osman (r.a) dəstəmaz almaq üçün su istədi. Ona gətirilən sudan əllərinə töküb onu üç dəfə yudu. Sonra sağ əli ilə qabdan su götürüb ağzını yaxaladı və burnunu (burnuna su çəkib çıxarmaqla) təmizlədi, sonra üç dəfə üzünü, üç dəfə də qollarını dirsəklərə[3] qədər yudu, başına məsh çəkdi və üç dəfə də ayaqlarını topuqlara[4] qədər yudu. Sonra dedi: «Mən Peyğəmbərin (s.ə.s) bu cür dəstəmaz alıb: "Kim mənim dəstəmazım kimi dəstəmaz alıb nəfsini danışdırmayaraq[5] iki rükət namaz qılarsa Allah onun keçmiş günahlarını bağışlayar" – dediyini eşitdim» (əl-Buxari, 159; Müslim, 537).

9. Amr ibn Əbu-l-Həsən Abdullah ibn Zeyddən (r.a) Peyğəmbərin (s.ə.s) dəstəmazı haqqında soruşdu. O, bir qab su istədi və Peyğəmbərin

[1] Yeddi dəfədən birini torpaqla yumaq.
[2] Yeddi dəfədən birində torpaqla suyu qarışdırmaqla yumaq.
[3] Dirsəklər daxil olmaq şərtilə.
[4] Topuqlar daxil olmaq şərtilə.
[5] Namaza aid olmayan işlər və s.

(s.ə.s) dəstəmazı kimi dəstəmaz aldı: qabdan su töküb üç dəfə əllərini yudu. Sonra sağ əli ilə qabdan su götürərək üç dəfə ağzını yaxaladı və burnunu (burnuna su alı çıxarmaqla) təmizlədi. Sonra üç dəfə üzünü, iki dəfə də qollarını dirsəklərə qədər yudu, sonra əllərini suya saldı və yaş əllərini başının önündən arxasına doğru və əksinə çəkərək bir dəfə məsh etdi və daha sonra ayaqlarını yudu. (əl-Buxari, 186; Müslim, 554).

Başqa bir rəvayətdə: «Başının önündən qafasına doğru məsh etdi, sonra isə əllərini məshi başladığı yerə doğru qaytardı» (Müslim, 556).

Başqa bir rəvayətdə: «Peyğəmbər (s.ə.s) bizim yanımıza gəldi və biz ona dəstəmaz almaq üçün misdən olan təurda[1] su gətirdik» (əl-Buxari, 197).

8-ci və 9-cu hədislərdən çıxarılan nəticələr:

– Əllərin, dəstəmaz alınan suya salınmasından öncə üç dəfə yuyulmasının şəriət qanunundan olması;

– Dəstəmaz aldıqda sağ tərəfdən başlamağın müstəhəb olması;

– Ağız və burunun yaxalanması hökmünün vacibə yaxın olması;

– Üzü üç dəfə yumağın müstəhəb olması[2]. Üzün həddi: saçların bitdiyi yerdən çənəyə qədər uzununa, qulaqdan o biri qulağa qədər isə eninə sayılır. Ağız və burunu üç dəfə yaxalamaq da bura daxildir;

– Əlləri dirsəklərə qədər (dirsəklər daxil olmaq şərtilə) üç dəfə yumağın müstəhəb olması[3];

– Bir dəfə başa məsh çəkməyin vacib olması;

– Ayaqları topuqlara qədər (topuqlar daxil olmaqla) üç dəfə yumağın müstəhəb olması [4];

– Əzaların yuyulmasını və məsh olunmasını tərtib ilə (ardıcıllıqla) etməyin vacib olması;

(Bu, Peyğəmbərin (s.ə.s) dəstəmazının kamil vəsfidir);

– Dəstəmaz aldıqdan sonra iki rükət namaz qılmağın müstəhəb olması;

– Namazın kamilliyi, qəlbin Allah ilə bağlı olmasından asılıdır ki, bu da insanı ixlaslı olmağa sövq edir. Şübhəsiz ki, namazda dünya işləri haqqında fikirləşmək namazın savabının azalmasına səbəbdir. Şeytan tərəfindən olunan vəsvəsələri tərk edən şəxs isə savaba nail olur;

Dəstəmazın kamil alınması kiçik günahların bağışlanmasına səbəbdir. Böyük günahlar isə yalnız tövbə ilə bağışlanır. Uca Allah buyurur:

---

[1] Tasa oxşar qab.
[2] Bu müstəhəbdir. Vacib isə bir dəfə yumaqdır.
[3] Bu müstəhəbdir. Vacib isə bir dəfə yumaqdır.
[4] Bu müstəhəbdir. Vacib isə bir dəfə yumaqdır.

إِن تَجْتَنِبُوا كَبَائِرَ مَا تُنْهَوْنَ عَنْهُ نُكَفِّرْ عَنكُمْ سَيِّئَاتِكُمْ وَنُدْخِلْكُم
مُّدْخَلًا كَرِيمًا ﴿٣١﴾

«Əgər sizə qadağan olunmuş böyük günahlardan çəkinərsinizsə, Biz də sizin qəbahətlərinizin (kiçik günahlarınızın) üstünü örtər və sizi şərəfli bir mənzilə çatdırarıq.» («ən-Nisa» surəsi, 31).

Tövbənin şərtləri isə bunlardır:

1) Tövbəni ixlas ilə Allah üçün etmək;
2) Keçmiş günaha görə peşmançılıq hissi keçirtmək;
3) Keçmiş günaha bir daha qayıtmamağı niyyət etmək;
4) Keçmiş günahı bir daha təkrar etməmək;
5) Tövbəni qəbul olunan vaxtda etmək.

Tövbənin qəbul olunmayan vaxtı ikidir:

1) Ölüm anında, can (ruh) boğaza yetişdiyi zaman. Uca Allah buyurur:

وَلَيْسَتِ التَّوْبَةُ لِلَّذِينَ يَعْمَلُونَ السَّيِّئَاتِ حَتَّىٰ إِذَا حَضَرَ
أَحَدَهُمُ الْمَوْتُ قَالَ إِنِّي تُبْتُ الْآنَ وَلَا الَّذِينَ يَمُوتُونَ وَهُمْ كُفَّارٌ ۚ
أُولَٰئِكَ أَعْتَدْنَا لَهُمْ عَذَابًا أَلِيمًا ﴿١٨﴾

«Günah işlər görməkdə davam edərək ölüm yetişən anda "Mən indi tövbə etdim" deyənlərin və kafir olaraq ölənlərin tövbəsi qəbul olunmaz. Biz onlar üçün şiddətli bir əzab hazırlamışıq» («ən-Nisa» surəsi, 18).

2) Qiyamət günü, günəş məğribdən çıxıb məşriqdə batdığı zaman. Uca Allah buyurur:

يَوْمَ يَأْتِي بَعْضُ آيَاتِ رَبِّكَ لَا يَنفَعُ نَفْسًا إِيمَانُهَا لَمْ تَكُنْ آمَنَتْ مِن قَبْلُ
أَوْ كَسَبَتْ فِي إِيمَانِهَا خَيْرًا ۗ قُلِ انتَظِرُوا إِنَّا مُنتَظِرُونَ ﴿١٥٨﴾

«Rəbbinin bəzi qiyamət əlamətləri gələcəyi gün əvvəlcə iman gətirməmiş və ya imanında bir xeyir qazanmamış şəxsə (sonrakı) imanı heç bir fayda verməz. De ki: "Gözləyin, doğrusu, biz də gözləyirik"» («əl-Ənam» surəsi, 158).

Əbu Hüreyrədən (r.a) rəvayət olunan hədisdə deyilir ki, «Peyğəmbər (s.ə.s) demişdir: "Günəş məğribdən çıxmayınca Qiyamət yetişməz. Günəş məğribdən çıxdığı zaman insanların hamısı iman gətirəcək, lakin heç bir

şəxsə o gün gətirdiyi imanı fayda verməyəcək". Sonra Peyğəmbər (s.ə.s) bu ayəni oxudu» («Səhih əl-Buxari», 8/147, 4636-cı hədis, «əl-Ənam» surəsi 168-ci ayənin şərhi).

– Ağız və burunu üç dəfə su ilə yaxalamağın müstəhəb olması [1];

– Əlləri dirsəklərə qədər (dirsəklər daxil olmaqla) iki dəfə yumağın caiz olması;

– Üzü yumaq üçün tək əl ilə (icmanın rəyinə görə isə həm də iki əl ilə) qabdan su götürməyin müstəhəb olması;

– Başı hərtərəfli məsh etməyin əfzəl olması.

10. Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) geyindikdə, darandıqda, yuyunduqda və hər bir işində sağdan başlamağı xoşlayardı» (əl-Buxari, 426; Müslim 615).

10-cu hədisdən çıxarılan nəticələr:

– Təmiz (pak) sayılan işlərdə sağdan başlamağın (və ya sağ əli istifadə etməyin) əfzəl olması;

– Murdar işlər üçün sol əlin işlədilməsi;

– Şəriətin bu yolla insanları islah etməsi;

– Dəstəmaz aldıqda sağ tərəfdən başlamağın əfzəl olması.

11. Nüeym əl-Muğmir Əbu Hüreyrədən (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Qiyamət günü ümmətimin dəstəmaz suyu dəydiyi üzləri, əlləri və ayaqları nur saçacaq. *Bacardığınız qədər artıq dəstəmaz alın*[2]» (əl-Buxari, 136).

Başqa bir rəvayətdə isə Əbu Hüreyrə (r.a) dəstəmaz aldıqda qollarını çiyinlərinə qədər[3], ayaqlarını da dizlərinə qədər[4] yuyub deyir: «Peyğəmbərin (s.ə.s): "Qiyamət günü ümmətimin dəstəmaz suyu dəydiyi üzləri, əlləri və ayaqları nur saçacaq. *Bacardığınız qədər artıq dəstəmaz alın*[5]" – dediyini eşitdim» (Müslim, 579).

12. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, sevimli Peyğəmbərimizin (s.ə.s): «Möminin bər-bəzəyi dəstəmaz suyunun dəydiyi əzalarındadır» – dediyini eşitdim. (Müslim, 585).

---

[1] Bu müstəhəbdir. Vacib isə bir dəfə yumaqdır.
[2] Maili qeyd olunmuş cümlə Əbu Hüreyrənin (r.a) əlavəsidir.
[3] Çiyinə yaxın.
[4] Dizə yaxın.
[5] Maili qeyd olunmuş cümlə Əbu Hüreyrənin (r.a) əlavəsidir.

11-ci və 12-ci hədislərdən çıxarılan nəticələr:

– Qolları dirsəkdən çox yuxarı, ayaqları da topuqdan çox yuxarıya qədər yumaq Əbu Hüreyrənin etdiyi əməldir (ictihaddır). Əbu Hənifənin, əş-Şafiinin, Əhmədin, İbn Həcərin, ən-Nəvəvinin və s. rəyinə görə bunu etmək caizdir. Lakin Malikin, ibn Teymiyyənin, ibnu-l-Qeyyimin, Abdurrahmən əs-Sədinin və s. rəyinə görə bu caiz deyildir.

Uca Allah qolları dirsəklərə qədər (dirsəklər də daxil olmaqla), ayaqları da topuqlara qədər (topuqlar da daxil olmaqla) yumağı əmr etmişdir. Peyğəmbər (s.ə.s) və onun səhabələri də davamlı olaraq belə etmişlər. Bu səbəbdən də ikinci rəy daha mötəbər sayılır.

– Əqidə və qeyb[1] ilə bağlı məsələlərdən fərqli olaraq fiqhi məsələlərdə ictihad etməyin caiz olması;

– Qiyamət günü dəstəmaz suyunun dəydiyi əzaların nur saçması.

**Birinci fəsil: «Ayaqyoluna daxil olmaq və təmizlənmək»**

13. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) ayaqyoluna daxil olduqda: «Allahummə inni əuzu bikə minə-l-xubsi və-l-xəbais!» (Allahım, şeytanlardan[2] və onların şərindən[3] sənə sığınıram!) – duasını oxuyardı. (əl-Buxari, 142; Müslim, 829).

13-cü hədisdən çıxarılan nəticələr:

– Ayaq yoluna daxil olmaq istədikdə bu duanın oxunmasının müstəhəb olması;

– Şeytanların şərindən qorunmaq üçün bu duanın oxunmasının əhəmiyyətli olması;

– Nəcasətdən təmizlənmənin vacib olması.

14. Əbu Əyyub əl-Ənsari (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Ayaqyolunda üzünüzü və ya arxanızı qibləyə yönəltməyin, yalnız şərqə və ya qərbə tərəf yönəlin![4]» (əl-Buxari, 144; Müslim, 608).

Əbu Əyyub (r.a) rəvayət edir ki: «Biz Şama gəldikdə, orada təharətxanaların[5] üzü qibləyə bina edildiyini gördük və Allahdan bağışlan-

[1] Cənnət, Cəhənnəm, mələklər və s.
[2] Erkək və dişi cinlər.
[3] Günahlardan.
[4] Yəni, yan tərəf qibləyə yönəlməlidir.
[5] Tualet.

mamızı diləyərək bacardığımız qədər o təharətxanalardan uzaqlaşdıq» (Müslim, 3-cü cild, səh.149).

14-cü hədisdən çıxarılan nəticələr:

– Subaşına çıxdıqda (yüngül və ya ağır) qibləyə tərəf yönəlməyin (üzü və ya arxası qibləyə tərəf oturmağın) qadağan olunması;

– Yanı qibləyə (sol və ya sağ) yönəlməyin vacib olması;

– Şəriətin (Allah və Onun elçisinin) buyurduğu və qadağan etdiyi əməllər bütün ümmətlər üçündür. Lakin bəzən müəyyən ümmətlər üçün xüsusiyyətlər olur ki, bu da onlardandır. Peyğəmbərin (s.ə.s) «Şərqə və ya qərbə tərəf yönəlin» əmri Mədinə və o ətrafda yaşayan sakinlər üçündür[1];

– Bunun hikməti şərəfli Kəbəni əzəmətləşdirmək və ona ehtiram etmək üçündür;

– Səhabələrin Şamdakı təharətxanalarda etdikləri istiğfar (bağışlanma diləmək) dil ilə ifadə olunmamışdır. Çünki subaşına çıxdıqda tələffüzlə Allahı zikr etmək olmaz.

15. Abdullah ibn Ömər ibni-l-Xəttab (r.a) rəvayət edir ki, «Bir gün mən Həfsanın (r.a)[2] evinin hasarına qalxdım və Peyğəmbərin (s.ə.s) üzü Şama, arxası da qibləyə oturaraq subaşına çıxdığını gördüm» (əl-Buxari, 148; Müslim, 611).

15-ci hədisdən çıxarılan nəticələr:

– Örtülü yerdə subaşına çıxdıqda arxası qibləyə yönəlməyin caiz olması.

Qeyd: İslam alimləri bu məsələdə ixtilaf etmişlər. Alimlərin bir qismi: «Örtülü və ya açıq olan yerdə subaşına çıxdıqda (üzü və ya arxası) qibləyə yönəlməyin əleyhinədir». Bu rəyi dəstəkləyənlərin dəlilləri aşağıdakılardır:

1) Subaşına çıxdıqda (üzü və ya arxası) qibləyə yönəlməyin qadağan olunmasına dair varid olan bütün hədislər.

2) Bu əməlin qadağan olunması Peyğəmbərin (s.ə.s) əmrindən, caiz olması isə hərəkətlərindən götürülüb və ola bilər ki, yalnız ona məxsus olsun.

Bu rəyi dəstəkləyən alimlər: Əbu Hüreyrə (r.a), İbn Məsud (r.a), Əbu Hənifə, Əhməd ibn Hənbəl, İbn Teymiyyə, İbnu-l-Qeyyim, Mücahid, ən-Nəxəi, əs-Səuri, İbn Həzm, Məhəmməd ibn İbrahim, ən-Nəvəvi, əş-Şəukəni, əl-Əvzai.

---

[1] Yəni cənub və şimal istiqamətində yaşayanlar. Lakin şərq və qərb istiqamətində yaşayanlar şimal və cənub tərəfə yönəlməlidirlər.

[2] Ömərin (r.a) qızı və Peyğəmbərin (s.ə.s) həyat yoldaşıdır.

Bu fəsildə olan hədisə əsaslanaraq, örtülü yerdə subaşına çıxdıqda (üzü və ya arxası) qibləyə tərəf yönəlməyi caiz sayan alimlər isə bunlardır:

Abdullah ibn Ömər (r.a), Malik ibn Ənəs, əş-Şafii, Əhməd ibn Hənbəl (başqa rəvayətdə), İshaq, Şabi, Üseymin, Əli Bəssəm.

Doğrusunu Allah bilir.

16. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) ayaqyoluna getdikdə mən və mənim kimi bir uşaq onun üçün su[1] və daş aparardıq. O isə su ilə təmizlənərdi» (əl-Buxari, 152; Müslim, 619).

16-cı hədisdən çıxarılan nəticələr:

– Ayaqyolunda su ilə təmizlənmək daş ilə təmizlənməkdən daha əfzəldir;

– Müsəlman subaşına çıxmazdan öncə təmizlənmək üçün su və s. hazırlamalıdır ki, sonra paltarı və ya bədəni nəcisə bulaşmasın;

– Övrət yerini başqasına göstərmək haram olduğu üçün müsəlman hər bir nəzərdən qorunmalıdır. Bu yalnız həyat yoldaşı üçün müstəsnadır;

– Uşaqların böyüklərə xidmət etməsi müstəhəbdir.

17. Əbu Qətadə əl-Haris ibn Rabi əl-Ənsari (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Sizdən biriniz sidik ifraz etdikdə sağ əli ilə cinsiyyət üzvündən tutmasın, yuyunduqda[2] da sağ əli ilə yuyunmasın və qabın[3] içinə üfürməsin!"» (əl-Buxari, 153; Müslim, 612).

17-ci hədisdən çıxarılan nəticələr:

– Sidik ifraz etdikdə sağ əli cinsi orqana toxundurmanın qadağan olunması;

– Ayaqyolunda (su və s. ilə) təmizləndikdə sağ əldən istifadə etməyin qadağan olunması;

– (ərzaq üçün istifadə olunan) Qabın içərisinə üfürməyin qadağan olunması;

Bu qadağan olunmuş əməllərin hansı hökmdə olduğu barədə alimlər ixtilaf etmişlər;

a) İcmanın (Əbu Hənifə, Malik, Şafii, Əhməd və s.) rəyinə görə bunlar məkruh sayılır (yəni bəyənilmir). Bu da daha mötəbər rəysayılır.

b) Zahirilərin rəyinə görə isə bunlar haram sayılır.

---

[1] Dəridən hazırlanmış kiçik su qabında.
[2] Nəcisdən təmizləndikdə.
[3] Su, yemək və s. ərzağın saxlandığı qab.

– Murdar sayılan işlərdə sol əlin istifadə olunması;
– Sağ əlin şərəfli və sol əldən əfzəl olması;
– Təmizliyə riayət etməyin vacib olması;
– Şəriət qanunlarının (insanı) fayda verən işlərə sövq etməsi və ziyan verən işlərdən çəkindirməsi. Bu da şəriətin yüksək səviyyədə olmasına dəlalət edir.

18. Abdullah ibn Abbas (r.a.) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) iki qəbrin yanında dayanıb dedi: «Bu qəbirdəkilər günah etdiklərinə görə əzab çəkirlər: onlardan birisi sidik ifraz etdikdə ondan təmizlənməzdi, o birisi isə söz gəzdirərdi[1]». Sonra yaş bir budaq qırıb onu iki yerə böldü və hər bir qəbrin üzərinə bir yarısını sancdı[2]. Səhabələr: «Nə üçün belə etdin, ey Allahın elçisi?» – deyə soruşduqda, o dedi: «Budaqlar quruyana qədər əzabları yüngülləşsin» (əl-Buxari, 218; Müslim, 675).

18-ci hədisdən çıxarılan nəticələr:
– Qəbr əzabının mövcud olması;
– Nəcisdən təmizlənməyənin qəbr əzabına düçar olması;
– İnsanlar arasında (fitnə-fəsad törətmək niyyətilə) söz gəzdirməyin haram olması;
– Söz gəzdirənin qəbr əzabına düçar olması;
– Peyğəmbərin (s.ə.s) öz səhabələrinə qarşı mərhəmətli olması və onları bu şərdən çəkindirməsi;
– Qeybətin caiz olmaması. Peyğəmbərin (s.ə.s) qəbrdə olanların adını qeyd etməməsi buna dəlalət edir;
– Hər bir günah sahibinin qəbrinin üzərinə yaş budaq sancmaqla onun əzabının yüngülləşməsi barədə olan rəylər:
a) Bəzi alimlər bu hədisə əsaslanaraq bu əməlin caiz olmasını iddia edir. Bunun üçün onlar «əl-İsra» surəsinin 44-cü ayəsinə də əsaslanırlar. Uca Allah bu ayədə buyurur:

وَإِنْ مِنْ شَيْءٍ إِلَّا يُسَبِّحُ بِحَمْدِهِ

«…Elə bir şey yoxdur ki, Allaha tərif deyib Ona şükr etməsin…» («əl-İsra» surəsi, 44)

[1] Fitnə-fəsad yaymaq üçün birinin sözünü o birisinə demək.
[2] Bu, yalnız Peyğəmbərə (s.ə.s) xas olan əməldir.

b) Əksər islam alimləri bu əməlin yalnız Peyğəmbərə (s.ə.s) xas olduğunu qəbul edirlər. Onların əsasları isə aşağıdakılardır:

1) Peyğəmbərin (s.ə.s) yalnız bu iki qəbrin üzərinə yaş budaq sancması.

2) Bu hadisədən sonra Peyğəmbərin (s.ə.s) bunu bir daha təkrar etməməsi.

3) Səhabələrdən bunun caiz olması haqqında rəvayətin olmaması.

4) Qəbirdə olanın əzab çəkməsi qeybi məsələdir və bunu bilmək üçün də yalnız peyğəmbər olmaq lazımdır.

5) Bu əməlin caiz olmasına dair göstərilən ayə, dəlil olmaq üçün münasib deyildir. Çünki ayə hər bir məxluqun Allahı tərif etməsinə dəlalət edir. Buradakı məsələ isə qəbrdə olan əzabın yüngülləşməsinə aiddir.

## İkinci fəsil: «Dişlərin misvakla[1] təmizlənməsi»

19. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Ümmətimə əziyyət olmasaydı, hər namaz üçün dişlərini misvakla təmizləməyi onlara əmr edərdim» (əl-Buxari, 887; Müslim, 1450).

19-cu hədisdən çıxarılan nəticələr:

– Dişlərin misvakla təmizlənməsinin fəzilətli və müstəhəb olması;

– Namaza başlamazdan əvvəl dişlərin misvakla təmizlənməsinin müstəhəb olması;

– İslam ümmətinə əziyyət olmasın deyə dişlərin misvakla təmizlənməsinin fərz (vacib) buyurulmaması;

– Peyğəmbərin (s.ə.s) ümmətinə qarşı şəfqətli və mərhəmətli olması;

– Şəriət qanunlarının çox yüngül və məşəqqətsiz olması. Uca Allah buyurur:

يُرِيدُ اللّٰهُ بِكُمُ الْيُسْرَ وَلَا يُرِيدُ بِكُمُ الْعُسْرَ

«…Allah sizin üçün ağırlıq deyil, yüngüllük istər…» («əl-Bəqərə» surəsi, 185).

– həqiqətən, fəsadı aradan qaldırmaq, fayda verməkdən əfzəldir. Dişlərin misvakla təmizlənməsinin faydalı olduğuna baxmayaraq, Peyğəmbər (s.ə.s) ümmətinin arasına düşə biləcək fəsadı aradan qaldırmaq üçün bunu onlara vacib buyurmadı.

---

[1] Xüsusi bitki olub, dişləri təmizləmək üçün istifadə olunur.

20. Hüzeyfə ibnu-l-Yəmən (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) gecə yuxudan oyandıqda dişlərini misvakla təmizləyərdi. (əl-Buxari, 245; Müslim, 593).

20-ci hədisdən çıxarılan nəticələr:

– Yuxudan oyandıqda dişlərin misvakla təmizlənməsinin fəzilətli və müstəhəb olması;

– Ağızda olan iyin dəyişildiyi zaman dişlərin misvakla təmizlənməsinin fəzilətli və müstəhəb olması;

– Bu əməlin təmizlik və ədəbdən sayılması.

21. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) başını sinəmə söykəmişdi. Bu vaxt Əbdürrəhman ibn Əbu Bəkr əs-Siddiq (r.a) əlində yaş misvak dişlərini təmizləyə-təmizləyə içəri daxil oldu. Peyğəmbər (s.ə.s) onun əlindəki misvaka nəzər saldı. Mən misvakı götürüb onu dişlərimin arasında əzdim və təmizləyib Peyğəmbərə (s.ə.s) verdim. O, misvakla dişlərini elə gözəl təmizlədi ki, bundan əvvəl dişlərini belə təmizlədiyini görməmişdim. Dişlərini təmizlədikdən sonra əlini və ya barmağını yuxarı qaldırdı, üç dəfə «Ən Uca ər-Rəfiqin (dostun) yanında» – dedi və başı sinəmdə ikən vəfat etdi» (əl-Buxari, 4438).

21-ci hədisdən çıxarılan nəticələr:

– Dişlərin yaş misvakla təmizlənməsinin müstəhəb olmas;

– Başqa misvakdan (onu təmizlədikdən sonra) istifadə etməyin caiz olması;

– İşarənin dəlalət etdiyi bir əməli yerinə yetirməyin caiz olması.

– «Ən Uca ər-Rəfiq» – Burada ən-Nisa surəsinin 69-cu ayəsində xatırlananlar qəsd olunur. Uca Allah bu ayədə buyurur:

وَمَن يُطِعِ اللَّهَ وَالرَّسُولَ فَأُولَٰئِكَ مَعَ الَّذِينَ أَنْعَمَ اللَّهُ عَلَيْهِم مِّنَ النَّبِيِّينَ
وَالصِّدِّيقِينَ وَالشُّهَدَاءِ وَالصَّالِحِينَ ۚ وَحَسُنَ أُولَٰئِكَ رَفِيقًا ﴿٦٩﴾

«Allaha və peyğəmbərə itaət edənlər (axirətdə) Allahın nemətlər verdiyi nəbilər, siddiqlər, şəhidlər və salehlərlə bir yerdə olacaqlar. Onlar isə necə də gözəl yoldaşlardır.

22. Əbu Musa əl-Əş‘ari rəvayət edir ki, Peyğəmbərin (s.ə.s) yanına gəldim və onun yaş misvakla dişlərini təmizlədiyini gördüm. O, misvakın

bir tərəfini dilinin üzərinə qoyaraq «u,u»[1] edirdi» (əl-Buxari, 244; Müslim, 591).

22-ci hədisdən çıxarılan nəticələr:
– Həqiqətən, dişləri misvakla təmizləmək ibadətdir;
– Dişləri daimi olaraq misvakla təmizləmək paklığın kamilliyindəndir[2];
– Hərdən misvakla dilin üst nahiyəsini təmizləmək müstəhəbdir.

**Üçüncü fəsil: «Xuffun[3] üzərinə məshin çəkilməsi»**

23. Əl-Muğira ibn Şöbə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) ilə səfərdə olanda onun ayağından xuffu çıxartmaq üçün əyildim. Bunu görən Peyğəmbər (s.ə.s) mənə dedi: «Onları çıxarma! Mən dəstəmazlı ikən onları ayağıma geyindim». Sonra onların üzərinə məsh çəkdi. (əl-Buxari, 206; Müslim, 630).

23-cü hədisdən çıxarılan nəticələr:
– Xuf üzərinə bir dəfə məsh çəkilməsinin caiz olması.
Əli ibn Əbu Talib (r.a) demişdir: «Din rəy (ağıl) ilə olsa idi, xuffun üzərinə deyil, altına məsh çəkmək daha düzgün sayılardı. Lakin mən Peyğəmbərin (s.ə.s) xuffunun üzərinə məsh çəkdiyini gördüm» (Əbu Davud, «Sünnə», 1-ci cild, səh.192, 162-ci hədis).
– Xuffu geyinərkən ayaqların təharətli (dəstəmaz alarkən yuyulmuş) olması, onun üzərinə çəkilən məshin caiz olması üçün şərtdir;
– Alimlərə və hörmətli insanlara xidmət etməyin müstəhəb olması (bəyənilənilməsi).

24. Hüzeyfə ibnu-l-Yəmən (r.a) deyir ki, mən Peyğəmbərlə (s.ə.s) birgə idim. O, subaşına çıxdı, dəstəmaz aldı və xuffunun üzərinə məsh çəkdi. (Müslim, 623).

24-cü hədisdən çıxarılan nəticələr:
– Səfərdə ikən xuffun üzərinə məsh çəkilməsinin caiz olması;
Səfərdə olan üçün məshin müddəti 3 sutka (72 saat), yerli sakin üçün isə bir sutkadır (24 saat). Müddəti (xuffu geyindikdən sonra) ilk məshin

[1] Qusmaq istəyənin çıxardığı səs kimi səs çıxarmaq.
[2] Yalnız oruc tutan şəxsə misvakdan uzun müddət istifadə etmək – mübaliğə etmək – caiz deyildir.
[3] Dəridən hazırlanmış ayaq geyimi.

çəkildiyi andan sayılır. Məsh etmək yalnız dəstəmaz alan üçün caizdir. Qüsl edən isə xuffu çıxarıb ayaqlarını yumalıdır.

### Dördüncü fəsil: «Məzi[1] və s. haqqında»

25. Əli ibn Əbu Talib (r.a) deyir ki, məndən çoxlu məzi ifraz olunurdu. Peyğəmbərin (s.ə.s) kürəkəni olduğum üçün bunun hökmünü ondan soruşmağa utanırdım. Ona görə də əl-Miqdad ibnu-l-Əsvədi (r.a) bu məsələnin hökmünü öyrənmək üçün onun yanına göndərdim. Rəsulullah (s.ə.s): «Cinsiyyət üzvünü yusun və dəstəmaz alsın» – deyə cavab verdi. (əl-Buxari, 269; Müslim, 693).

25-ci hədisdən çıxarılan nəticələr:

– Məzinin nəcasət (murdar) sayılması və (ona bulaşan yerin) yuyulmasının vacib olması;

– Məzi cinsiyyət üzvündən gəldiyinə görə dəstəmazı pozan amillərdən sayılması;

– Cinsiyyət üzvünün yuyulmasının vacib olması;

– Bu halda qüsl etməyin vacib olmaması;

– Məzinin su ilə yuyulmasının vacib olması.

26. Abdullah ibn Zeyd ibn Asim əl-Mazini (r.a) rəvayət edir ki, namaz qılarkən nəfsinə şübhə[2] düşən bir kişi barəsində Peyğəmbərə (s.ə.s) şikayət edildikdə o dedi: «Səs eşitməyincə və ya iy hiss etməyincə namazı tərk etməsin» (əl-Buxari, 177; Müslim, 802).

26-cı hədisdən çıxarılan nəticələr:

– Təharətin pozulub-pozulmamasına olan şəkk nə dəstəmazı, nə də namazı batil etmir;

– Səbəbsiz olaraq namazı tərk etmək haramdır;

– Arxadan çıxan səsli və ya iyli hava dəstəmazı batil edən amildir.

Qeyd: Arxadan çıxan səssiz və iysiz hava da dəstəmazı batil edən amildir.

27. Ummu Qeys bint Mihsan əl-Əsədiyyə (r.a) rəvayət edir ki, o, südəmər oğlunu gətirib Peyğəmbərin (s.ə.s) dizinin üstündə otuzdurdu və uşaq onun

---

[1] Şəhvət nəticəsində cinsiyyət üzvündən çıxan ağ rəngli, duru maye.

[2] Yəni, ondan yel çıxdığını zənn etməklə namazdan yayınan.

paltarına sidik ifraz edib onu batırdı. Peyğəmbər (s.ə.s) paltarının üzərinə su səpdi və onu yumadı» (əl-Buxari, 223; Müslim, 663).

28. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbərin (s.ə.s) yanına bir uşaq gətirdilər və o, onun paltarını batırdı. Peyğəmbər (s.ə.s) paltarının üzərinə su səpdi və onu yumadı» (əl-Buxari, 222; Müslim, 660).

27-ci və 28-ci hədislərdən çıxarılan nəticələr:

– Südəmər oğlan uşağının sidik ifraz etməklə batırdığı yerin təmizlənməsi üçün həmin yerə su səpmək kifayət edir;

– Südəmər qız uşağının sidik ifraz etməklə batırdığı yeri isə yumaq lazımdır;

– Yemək yeyən oğlan və ya qız uşağının sidik ifraz etməklə batırdığı yeri yumaq lazımdır.

Qeyd: Ağır subaşına çıxanın yaşından və cinsindən asılı olmayaraq batırdığı yeri yumaq vacibdir.

– Bu hədis həmçinin peyğəmbərin (s.ə.s) əxlaqlı və təvazökar olmasına da dəlildir.

29. Ənəs ibn Malik rəvayət edir ki, «Bir bədəvi[1] gəlib məscidin içini (ora sidik ifraz etməklə) batırdı. Səhabələr onu qovub məsciddən xaric etmək istədikdə Peyğəmbər (s.ə.s) qoymadı. Sonra onun batırdığı yerə bir qab su tökməyi əmr etdi və ora su töküldü» (əl-Buxari, 221; Müslim, 657, 658).

29-cu hədisdən çıxarılan nəticələr:

– Sidik ifraz olunan torpağın üzərinə su tökməklə o yeri təmizləmək;

– Məscidləri təmiz saxlamaq və orada ədəbsizlik etməmək;

– Peyğəmbərin (s.ə.s) mülayim, rəhmli və əxlaqlı olması;

Qeyd: İnsanlardan uzaq olmaq cəhalət doğurur. Səhrada yaşayan bədəvi ərəb də buna misaldır.

30. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbərin (s.ə.s): «Beş şey fitrətdəndir[2]: cinsiyyət üzvündəki artıq əti kəsmək, qasıqdakı tükləri təmizləmək, bığları qısaltmaq, dırnaqları kəsmək və qoltuqaltı tükləri qopartmaq» – dediyini eşitdim. (əl-Buxari, 5889; Müslim, 596).

---

[1] Səhrada yaşayan (köçəri) ərəb.
[2] Sünnətdəndir.

30-cu hədisdən çıxarılan nəticələr:

– Cinsiyyət üzvündəki dərini kəsmək vacibdir. Bu hökm yalnız kişi cinsinə şamil edilir.

– Övrət yerinin tüklərini qırxmaq, bığları qısaltmaq, dırnaqları kəsmək və qoltuqaltı tükləri qopartmaq (və ya qırxmaq) müstəhəbdir.

Qeyd: Bunları etmək təmizlik və İslamın gözəlliyindəndir. Həmçinin müsəlmanın təmizliyi onun imanındandır. Əbu Malik əl-Əşaridən (r.a) rəvayət olunan hədisdə Peyğəmbər (s.ə.s) demişdir: «Təmizlik imanın yarısıdır…» (Müslim, 3-cü cild, səh.95, 533-cü hədis).

– Hər bir xeyirə can atmaq və şərdən uzaq olmaq insanın fitrətindəndir;

– İslam dini gözəlliyə, təmizliyə və kamilliyə dəvət edən bir dindir;

Bu hədisdə qeyd olunan beş əməldən başqa təmizlikdən sayılan başqa əməllər də var ki, onlar müxtəlif hədislərdə qeyd olunmuşdur;

Bunlara riayət edən müsəlman ikiqat fayda (yəni dünyada ikən təmizlik, axirəti üçün isə savab) əldə etmiş olur.

## Beşinci fəsil: «Cənabət qüslü»

31. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, cənabət[1] halında Mədinənin küçələrindən birində Peyğəmbər (s.ə.s) ilə rastlaşdım. Gizlincə ondan uzaqlaşıb gedib qüsl etdim, sonra Peyğəmbərin (s.ə.s) yanına qayıtdım. O: «Əbu Hüreyrə, harada idin?» – deyə soruşduqda, mən dedim: «Mən cənabət halında idim. Belə natəmiz halda da sənin yanında oturmaq istəmədim». O dedi: «Subhənallah! Müsəlman (başqa bir rəvayətdə: mömin) murdarlanmaz!» (əl-Buxari, 283; Müslim, 822, 823).

31-ci hədisdən çıxarılan nəticələr:

– Cənabət halı murdar hal sayılmır (yəni müsəlmanın zatı heç zaman murdarlanmır);

– Qüslü gecikdirmək caizdir;

– Elm əhli və s. bu kimi hörmətli insanlar arasında ən gözəl qiyafədə iştirak etmək;

– Məclisi tərk etdikdə izn istəmək müstəhəbdir.

32. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) cənabət qüslü etdikdə əllərini yuyar, sonra dəstəmaz alar, sonra üç dəfə başına su töküb əlləri[2] ilə

---

[1] Cinsi əlaqədən və ya hər hansı yolla məni ifraz edilməsindən sonrakı hal.

[2] Barmaqlarını saçlarının arasına daxil etməklə.

onu saçlarının dibinə çatdırar və daha sonra bədəninin qalan yerini yuyardı» (əl-Buxari, 272; Müslim, 716).

33. Aişə (r.a) deyir ki, «Mən Peyğəmbər (s.ə.s) ilə bərabər bir qabdan su götürərək qüsl edərdik» (əl-Buxari, 273; Müslim, 729).

32-ci və 33-cü hədislərdən çıxarılan nəticələr:

– Cənabət qüslü vacibdir;

Bu hədisdə Peyğəmbər (s.ə.s) qüslün kamil şəkildə edilməsini bizə öyrətmişdir. Lakin başqa hədislərdə o, bədənin hər yerini su ilə (ardıcıllığa riayət etmədən) yumaqla vacib olan qüslü də bizə öyrətmişdir;

– Ər-arvadın, birinin digərinin övrət yerinə baxması caizdir;

– Ər-arvadın bərabər qüsl etməsi caizdir.

Qeyd: Bəzi müsəlmanlar ər-arvadın, birinin digərinin övrət yerinə nəzər salmasının haram olduğunu iddia edirlər və dəlil olaraq aşağıdakı hədislərə istinad edirlər:

1) Aişə (r.a) demişdir: «Mən Peyğəmbərin (s.ə.s) övrətini heç zaman görməmişəm».

Bu hədis bir neçə isnadla rəvayət olunub, lakin onların heç biri mötəbər deyildir.[1]

* Təbərani, Xətib və Əbu Nüeymin rəvayət etdiyi isnadda Bərəkə ibn Məhəmməd əl-Hələbi adında ravi (hədis rəvayət edən) yalançı və hədis uyduranlardandır.

* İbn Macə və İbn Sədin rəvayət etdiyi isnadda ravilərdən biri məchuldur (yəni onun kim olduğu bəlli deyil).

2) İbn Abbas (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Sizdən biriniz zövcəsi və ya cariyəsi ilə cinsi əlaqədə olduqda onun fərcinə (cinsiyyət üzvünə) baxmasın! Həqiqətən, bu, korluq əmələ gətirir».[2]

Bu hədis bir neçə isnadla rəvayət olunub, lakin onların heç biri mötəbər deyildir.

* İbn Adiy, İbn Əsakir, İbn Əbi Hatimin rəvayət etdiyi isnadda Bəqiyyə adlı ravi yalançılardan rəvayət etməklə məşhurdur.

34. Peyğəmbərin (s.ə.s) həyat yoldaşı Meymunə bintu-l-Haris (r.a) deyir ki, «mən Peyğəmbərə (s.ə.s) qüsl etmək üçün su gətirdim. O, suyu sağ əli ilə sol əlinin üzərinə iki və ya üç dəfə tökdü, sonra övrət yerini yudu. Sonra iki və ya üç dəfə əlini yerə (və ya divara) vurdu, sonra ağzını, burnunu, üzünü və

[1] Əlbaninin «Ədəbu-z-zifaf» («Evlənmə ədəbləri») əsəri, səh.37.
[2] Əlbaninin «Zəif hədislər silsiləsi» əsəri, 1/351, 195-ci hədis.

qollarını yudu, sonra başına su tökdü və bədəninin qalan yerini də yudu, daha sonra isə qırağa çəkilib ayaqlarını yudu. Mən qurulanmaq üçün ona dəsmal gətirdim. O dəsmalı götürməyib əllərinin suyunu çırpdı» (əl-Buxari, 274, 276; Müslim, 765).

34-cü hədisdən çıxarılan nəticələr:
– Əlləri iki və ya üç dəfə yumağın caiz olması;
– Bədəni dəsmalla qurulamamağın caiz olması;
– Qüslün dəstəmazı əvəz etməsi;
– Qüslün əvvəlində övrət yerinin yuyulması;
– Əzaları bir dəfə yumaqla kifayətlənmək;

35. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, atası Ömər ibn əl-Xəttab (r.a) Rəsulullahdan (s.ə.s): «Ey Allahın elçisi! Bizdən birimiz cənabət halında yata bilərmi?» – deyə soruşdu. O dedi: «Bəli, sizdən biriniz cənabət halında olarsa dəstəmaz alıb yatsın!» (əl-Buxari, 287; Müslim, 700).

35-ci hədisdən çıxarılan nəticələr:
– Cənabətli halda yatmazdan əvvəl dəstəmaz almağın müstəhəb olması;
– Cənabətli olanın, qüsl və ya dəstəmaz almayıb yatmasının məkruh (bəyənilməyən) olması.

36. Peyğəmbərin (s.ə.s) zövcəsi Ummu Sələmə (r.a) rəvayət edir ki, Əbu Təlhənin(r.a) zövcəsi Ummu Suleym (r.a) Peyğəmbərin (s.ə.s) yanına gəlib dedi: «Ey Allahın elçisi! Həqiqətən, Allah haqqı soruşana utanmağı əmr etmir. Məgər qadın pollyusiya[1] halında qüsl etməlidir?» Peyğəmbər (s.ə.s) dedi: «Bəli, əgər məninin[2] əsər-əlamətini (paltarında və ya bədənində) görübsə qüsl etməlidir» (əl-Buxari, 282; Müslim, 710).

36-cı hədisdən çıxarılan nəticələr:
– Yuxuda ikən məni ifraz edən qadın qüsl etməlidir;
– Allahın Özünə layiq olan sifətdə həyalı olması;
– Elm tələb etdikdə utanmamaq. Hətta utanmaq lazım gələn məsələlərdə belə öyrənmək üçün sual vermək caizdir. Həqiqətən, iki şəxs elm öyrənə bilməz: utanan və təkəbbürlü olan.
– Utandırıcı sual verməzdən əvvəl, soruşulan şəxsə münasib başlıq ilə (Allah haqqı deməkdən utanmaz və s.) müraciət etmək.

[1] Yuxuda olarkən məni ifraz etmək.
[2] Sperma.

37. Aişə (r.a) rəvayət edir ki, «mən Peyğəmbərin (s.ə.s) üzərinə məni düşmüş paltarını yuyardım və onun ləkəsi getməsə də Rəsulullah (s.ə.s) o paltarda namazını qılardı» (əl-Buxari, 231; Müslim, 670).

Başqa bir rəvayətdə deyir ki, «əlimlə onu sürtərdim və Peyğəmbər (s.ə.s) də o paltarla namazını qılardı» (Müslim, 672).

37-ci hədisdən çıxarılan nəticələr:

İslam alimləri məninin hökmü barəsində müxtəlif rəydədirlər:

* Hənəfi və Maliki məzhəbinə görə məni nəcis sayılır. Onlar dəlil olaraq bu hədisə əsaslanırlar və deyirlər ki, Aişənin (r.a) Peyğəmbərin (s.ə.s) paltarını yuması, məninin nəcis olmağına dəlalət edir.

* Şafii, Hənbəli məzhəbi, İbn Həzm, hədis əhli və İbn Teymiyyənin rəyinə görə məni nəcis sayılmır. Onlar aşağıdakı dəlillərə əsaslanırlar:

a) Aişənin (r.a) Peyğəmbərin (s.ə.s) paltarını sürtməsi buna dəlalət edir. Nəcis olsa idi, sürtməklə kifayətlənməz, əksinə onu yuyardı.

b) İnsan mənidən törənmişdir və ağıla sığılmazdır ki, Uca Allah onu nəcisdən (murdar maddədən) yaratsın.

v) Peyğəmbər (s.ə.s) sidikdən təmizlənməyi əmr etdiyi kimi mənidən təmizlənməyi əmr etməmişdir.

q) Məniyə bulaşmış paltarın yuyulması onun nəcis olmasına dəlalət etmir, məs. palçıq və s. bulanmış paltarın yuyulması kimi.

– Məni bulaşmış paltarın, bədənin və s. yuyulmasının vacib olmaması;

– Məninin nəcis sayılmaması;

– Məni bulaşmış paltarın, bədənin və s. yuyulmasının müstəhəb olması.

38. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Qadınının əlləri və ayaqları arasında oturub ona cəhd[1] göstərənə qüsl etmək vacibdir» (əl-Buxari, 291; Müslim, 781).

Başqa bir rəvayətdə: «məni ifraz etməsə belə» (Müslim, 782).

38-ci hədisdən çıxarılan nəticələr:

– Cinsi əlaqədə olana, məni ifraz etməsə belə, qüsl etməyin vacib olması.

39. Əlinin (r.a) nəvəsi Məhəmməd rəvayət edir ki, o, atası Hüseyn (r.a) və bir dəstə camaat Cabir ibn Abdullahdan (r.a) qüsl haqqında soruşdular.

[1] Onunla cinsi əlaqədə olmaq.

O dedi: «Bir saa[1] kifayət edər». Bir kişi: «Mənə kifayət etmir» – dedikdə, Cabir ona: «Səndən çox saçı olan və səndən də xeyirlisinə (yəni Peyğəmbərə (s.ə.s) kifayət edərdi» – deyib sonra bizə imamlıq edib namazı qıldırdı. (əl-Buxari, 252; Müslim, 731).

Başqa ləfzdə olunan rəvayət: «Peyğəmbər (s.ə.s) üç dəfə başına su tökərdi» (əl-Buxari, 255).

Müəllif deyir ki, Cabirə (r.a) «Mənə kifayət etmir» – deyən kişi Məhəmmədin[2] oğlu Həsəndir.

39-cu hədisdən çıxarılan nəticələr:

– Cənabət qüslünün vacib olması;

– Dörd ovuc suyun qüsl etmək üçün kifayət olması;

– Suyu israf (həddindən artıq lazımsız yerə istifadə etmək) etməməyin müstəhəb olması;

– Peyğəmbərin (s.ə.s) sünnəsinə müxalif olanhər bir əməlin inkar edilməsi.

## Altıncı fəsil: «Təyəmmüm[3]»

40. İmran ibn Hüseyn (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) bir kişinin qırağa çəkilib camaatla namaz qılmadığını görüb ona dedi: «Ey filankəs! Camaatla namaz qılmağına mane olan nədir?» O: «Ey Allahın elçisi! Cənabət halındayam, su da yoxdur» – dedikdə, Peyğəmbər (s.ə.s) dedi: «Torpaqla təmizlən, bu sənə kifayət edər» (əl-Buxari, 344).

40-cı hədisdən çıxarılan nəticələr:

– Təyəmmüm (su olmadıqda) qüslü əvəz edir;

– Təyəmmümü yalnız zərurət halında (su tapılmadıqda, xəstələndikdə və s. zəruri hallarda) etmək caizdir;

– Səhv və ya günah işlədən şəxsi dərhal təhqir etmək, günahlandırmaq və acılamaq caiz deyil. Çünki ola bilər ki, onun etdiyi əməl hər hansı bir üzrlü səbəbə görə olsun;

– Elmi məsələlərdə ictihad etmək (müctəhid üçün) caizdir.

---

[1] Yə‘ni, dörd ovuc.

[2] Məhəmməd ibn Əli (r.a).

[3] Torpaqla təmizlənmək.

41. Əmmar ibn Yasir (r.a) deyir ki, Peyğəmbər (s.ə.s) məni bir iş üçün göndərdi. Yolda cənabət halına düşdüm və su tapmadığım üçün heyvanın torpaqda eşələndiyi kimi torpaqda eşələndim, sonra bunu Peyğəmbərə (s.ə.s) xəbər verdim. Peyğəmbər (s.ə.s): «Sənə əlini torpağa vurub təmizlənmək kifayət edərdi» – deyib əllərini bir dəfə torpağa vurdu, sonra sol və sağ əlinə və üzünə məsh çəkdi» (əl-Buxari, 347; Müslim, 110).

41-ci hədisdən çıxarılan nəticələr:

– Təyəmmüm etməzdən əvvəl su axtarmağın vacib olması;

– Təyəmmüm edən şəxsə bir dəfə əllərini torpağa vurmaqla üz və əllərini (biləklərə qədər) məsh etməsi;

– Təyəmmümün qüslü əvəz etməsi;

– Təyəmmümü tərtiblə (əvvəlcə üzü, sonra da əlləri məsh etməklə) yerinə yetirməyin[1] vacib olması;

– İctihad etməyin caiz olması;

42. Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Mənə beş şey verilib ki, bunlar məndən əvvəlki peyğəmbərlərə verilməyib: bir ay əvvəl düşmənin qəlbinə qorxu salaraq ona qalib gəlməyim, yer üzünün mənim üçün pak və məscid[2] olması – belə ki, ümmətimdən olan hər bir şəxs istənilən yerdə vaxtı girmiş namazı qılmalıdır, – qənimətlərin[3] mənə halal olması – məndən qabaq heç bir peyğəmbərə halal olmayıb –, Qiyamət günü şəfaət[4] verməyim və bir də, hər bir peyğəmbər yalnız öz qövmünə göndərilərdi, mən isə bütün insanlara göndərilmişəm» (əl-Buxari, 335; Müslim, 1163).

42-ci hədisdən çıxarılan nəticələr:

– Peyğəmbərin (s.ə.s) başqa peyğəmbərlərdən, ümmətinin də başqa ümmətlərdən əfzəl olması;

– Peyğəmbərə (s.ə.s) və onun ümmətinə bu beş xüsusiyyətin verilməsi;

– Torpaqdan təyəmmüm etməyin caiz olması;

– İstənilən yerdə (müstəsna olan yerlərdən başqa[5]) namaz qılmağın caiz olması;

– Qəniməti mənimsəməyin halal olması;

---

[1] Uca Allah buyurmuşdur: «Su tapmasanız, pak torpaqla təyəmmüm edin, ondan üzünüzə və əllərinizə sürtün» («əl-Maidə» surəsi, 6).

[2] İbadət yeri olması.

[3] Cihadda əldə edilən mal.

[4] Böyük şəfaət.

[5] Murdar olan yerlər, qəbiristanlıq və qəsb edilmiş məkan.

– Namazı öz vaxtında qılmağın vacib olması;
– İslam dininin bütün bəşəriyyətə göndərilməsi.

Bu hədisdən əlavə, aşağıdakı ayə də Peyğəmbərin (s.ə.s) bütün bəşəriyyətə göndərilməsinə dəlalət edir. Uca Allah buyurur:

قُلْ يَا أَيُّهَا النَّاسُ إِنِّي رَسُولُ اللَّهِ إِلَيْكُمْ جَمِيعًا

«[Ya Məhəmməd!] De ki: "Ey insanlar! Mən Allahın sizin hamınıza göndərilmiş elçisiyəm (peyğəmbəriyəm)"…» («əl-Əraf» surəsi, 158).

## Yeddinci fəsil: «Heyz[1]»

43. Aişə (r.a) rəvayət edir ki, Əbu Hübeyşin qızı Fatimə (r.a): «Mən davamlı istihazə[2] oluram. Buna görə namazımı tərk edimmi?» – deyə Peyğəmbərdən (s.ə.s) soruşdu. O: «Xeyr, o bir tərdir, lakin adətin üzrə heyz olduğun günlər namazları tərk et, sonra isə qüsl edib namazını qıl» – deyə cavab verdi. (əl-Buxari, 306; Müslim, 753).

Başqa rəvayətdə: «Bu heyz qanı deyil. Yalnız heyz olduqda namazını tərk et, sonra isə yuyunub namazını qıl» (Müslim, 751).

44. Aişə (r.a) rəvayət edir ki, Ummu Həbibə[3] (r.a) yeddi il istihazə oldu və bu haqda Peyğəmbərdən (s.ə.s) soruşdu. O: «Bu bir tərdir» – deyib yuyunmağı ona əmr etdi. Ummu Həbibə də hər namaz üçün yuyunardı. (əl-Buxari, 327; Müslim, 754).

43-cü və 44-cü hədislərdən çıxarılan nəticələr:
– Heyz və istihazənin arasında olan fərq;
a) Heyz qanı müəyyən günlərdə gəlir, lakin istihazə qanı hər zaman gələ bilər;
b) İstihazə qanı ibadət etməyə mane olmur. Heyz qanı gəldiyi zaman isə ibadət dayandırılır;
– Heyz zamanı buraxılan namazların qəzası qılınmamalıdır. Bu rüxsət Allah və Onun elçisi tərəfindəndir.

[1] Qadından hər ayın müəyyən günlərində gələn qan.
[2] Adəti üzrə gələn qandan çox (əlavə günlərdə) gələn qan.
[3] Ummu Həbibə bint Cəhş.

– İstihazə olan qadına, hər namaz üçün qüsl etmək vacib deyil. Bir dəfə qüsl edib (heyzdən təmizləndikdən sonra) sonra isə yalnız dəstəmaz almaq kifayətdir.
– Öyrənmək üçün sual verdikdə utanmamaq.

45. Aişə (r.a) rəvayət edir ki: «Mən və Peyğəmbər (s.ə.s), hər ikimiz cənabətli[1] olduğumuz halda bir qabdan su götürərək qüsl edərdik» (əl-Buxari, 299; Müslim, 729).

46. Aişə (r.a) rəvayət edir ki: «Mən heyzli olarkən, Peyğəmbər (s.ə.s) övrət yerimi[2] bağlamağımı əmr edər, sonra da mənimlə yaxınlıq[3] edərdi» (əl-Buxari, 300; Müslim, 677).

47. Aişə (r.a) rəvayət edir ki: «Peyğəmbər (s.ə.s) etikafda olarkən başını (məsciddən qırağa) çıxardar və mən də heyzli halda onun başını yuyardım» (əl-Buxari, 301; Müslim, 684).

48. Aişə (r.a) rəvayət edir ki: «Mən heyzli olarkən Peyğəmbər (s.ə.s) mənə söykənib Quran oxuyardı» (əl-Buxari, 297; Müslim, 691).

45-ci, 46-cı, 47-ci və 48-ci hədislərdən çıxarılan nəticələr:
– Ər-arvadın bərabər yuyunmasının caiz olması;
– Heyzli qadınla cinsi əlaqədən başqa hər bir zövq verən hərəkət (haram buyurulmuş əlaqədən başqa[4]) etməyin caiz olması.
– Qadının bu halda cinsi orqanını örtməsi;
– Bu halda məscidə daxil olmamaq;
– Etikafda olan şəxs hər hansı bir bədən üzvünü məsciddən xaricə çıxararsa, bu onun etikafını batil etmir.
– Heyzli qadına söykənib Quran oxumağın caiz olması.

49. Muazətu bint Abdullah (r.a) rəvayət edir ki, mən Aişədən (r.a): «Nə üçün heyzli qadın orucun qəzasını tutur, namazın qəzasını isə qılmır?» – deyə soruşdum. O məndən: «Sən Hərurisən[5]?» – deyə soruşduqda, mən: «Xeyr, Həruri deyiləm, lakin öyrənmək üçün soruşuram» – cavabını

[1] Cinsi əlaqədən sonra.
[2] Yalnız cinsi orqan.
[3] Cinsi əlaqədən başqa hər şey (öpmək, qucaqlamaq və s.).
[4] Arxa dəlikdən cinsi əlaqədə olmaq.
[5] Hərura: Kufədən iki mil aralıda yerləşən şəhərdir. Burada Aişə (r.a) xaricilərin qolundan olan cərəyanı nəzərdə tutur.

verdim. Aişə dedi: «Biz heyzli olarkən oruc və namazı tərk edir, sonra isə yalnız orucun qəzasını tutmağa əmr olunardıq» (əl-Buxari, 321; Müslim, 761).

49-cu hədisdən çıxarılan nəticələr:

– Qadın heyzdən təmizləndikdən sonra namazın qəzasını qılmır, orucun isə qəzasını tutmalıdır;

– Sünnəni bəyənməyənə e'tiraz etmək;

– Peyğəmbərin (s.ə.s) hər hansı bir əməli təsdiq etməsi sünnətdəndir (yəni ibadətdəndir);

– Öyrənmək və doğru yol ilə getmək istəyənə elmi bəyan etmək.

***Xülasə.***

Suyun qismləri:

– tahur (təmiz);

– nəcis (murdar).

Nəcasətin növləri:

– insanın sidik və nəcisi;

– əti yeyilməyən heyvanların sidik və nəcisi;

– itin seliyi (ağız suyu);

– heyz, nifas və istihazə nəticəsində çıxan qan;

– donuz;

– məzi;

– meyit.

Dəstəmazın şərtləri:

– müsəlman olmaq;

– həddi-büluğa çatmaq;

– ruhi xəstə olmamaq;

– təmiz su tapmaq;

– niyyət etmək;

– suyun dəriyə çatmasına mane olan hər bir amili (boya, lak və s.) aradan qaldırmaq;

– bədənin nəcasətdən təmizlənməsi (paklaşdırılması);

– sidik və ya nəcisdən azad olmaq.

Bu şərtlərdən biri yerinə yetirilməzsə dəstəmaz batil olur.

Dəstəmazın vacibləri:

– üzü yumaq, ağzı yaxalamaq, buruna su alıb çıxartmaqla onu təmizləmək;

– qolları, barmaqların ucundan dirsəklərə qədər – dirsəklər də daxil olmaqla – yumaq;

– başa və qulağa məsh etmək;

– ayaqları, barmaqların ucundan topuqlara qədər – topuqlar da daxil olmaqla – yumaq;

– bu vacibləri ardıcıl yerinə yetirmək

– bu vacibləri fasiləsiz (ara vermədən) yerinə yetirmək

Dəstəmazın sünnələri:

– dəstəmaza başladıqda «bismilləh» demək;

– misvakla dişləri təmizləmək;

– əlləri yumaq;

– barmaqların arasını yumaq;

– sıx saqqalın dibinə su çatdırmaq (seyrək saqqalın dibinə su çatdırmaq isə vacibdir);

– əzaları iki və ya üç dəfə yumaq;

– əzaları sağ tərəfdən başlayaraq yumaq;

– dəstəmazdan sonra dua oxumaq;

– suyu israf etməmək.

Dəstəmazı batil edən amillər:

– öndən və arxadan çıxan sidik, nəcis, məzi, istihazə halında gələn qan və s.

– dərin yuxuya getmək və ya huşu itirmək;

– dəvə əti yemək (bir çox alimlərin rəyinə görə);

– cinsi əlaqəyə girmək (bu həm də qüslü batil edir);

– heyz və nifas halı (bu həm də qüslü batil edir);

– pollüsiya[1] baş verdikdə (bu həm də qüslü batil edir);

– övrət yerinə toxunmaq (bəzi alimlərin rəyinə görə);

Məshin şərtləri:

– ayaqqabı, corab və ona oxşar ayaq geyimlərini dəstəmaz aldıqdan sonra geymək;

– ayaq geyiminin üzərində nəcisin olmaması;

[1] Yuxuda məninin ifraz olması.

– məshdən yalnız dəstəmaz aldıqda istifadə etməli (qüsl etdikdə isə ayaqlar yuyulmalıdır);

– məshin müddəti dəstəmaz alınıb ilk məsh çəkilən andan başlayaraq müsafir üçün üç sutka (72 saat), yerli sakin üçün isə bir sutka (24 saat) davam edir.

Qeyd: Məshin müddətinin bitməsi onu batil etmir.

Qüslü vacib edən hallar:

– heyz və nifasdan təmizləndikdə;

– cinsi əlaqədə olduqda;

– şəhvət nəticəsində məni ifraz olunduqda;

– cümə namazına getdikdə (Bir çox alimlərin rəyinə görə);

– islam dininə daxil olduqda.

Qüslün növləri:

– kamil qüsl, yəni Peyğəmbərin (s.ə.s) göstərdiyi qaydada qüsl etmək;

– vacib qüsl, yəni bədənin hər yerini yumaqla kifayətlənmək.

Hər iki halda olunan qüsl mötəbər sayılır, lakin kamil qüsl edən daha çox savaba nail olur.

Təyəmmüm:

Ovucların içini təmiz torpağa və ya üzərində toz-torpaq olan yerə vurmaq, sonra əlləri üzə sürtmək, daha sonra əlləri biri-birinə sürtmək.

Aşağıdakı hallarda namaz təyəmmümlə əvvəl vaxtında qılınır:

– suyun tapılmayacağına əmin olduqda;

– suyun tapılmayacağına daha çox ehtimal olduqda;

– suyun tapılıb-tapılmayacağına tərəddüd olduqda;

Bu hallarda namazı təyəmmümlə qıldıqdan sonra su tapıldıqda namaz yenidən qılınmır.

Subaşına çıxmağın ədəbləri:

– Subaşına çıxdıqda dua etmək;

– üzü və arxası qibləyə oturmamaq;

– nəzərdən qorunmaq;

– ayaqyolunda (tualetdə) danışmamaq;

– axmayan sulara sidik və ya nəcis ifraz etməmək;

– sidik ifraz edərkən ayaq üstə durmamaq;

– ön və arxa ifrazat çıxışlarını su, kağız və s. buna bənzər təmizləyici ilə təmizləmək;

– sağ əllə təmizlənməmək;

– ifrazat çıxışlarını ehtiram olunan əşyalarla(şəkil, yeyinti məhsulu və s.) təmizləməmək;

– ayaqyoluna sol ayaqla daxil olub sağ ayaqla çıxmaq;

– ayaqyolundan çıxdıqda dua etmək;

– ayaqyolundan çıxdıqda əlləri sabunla yumaq.

Qeyd: İki şərtlə ayaq üstə sidik ifraz etmək caizdir: 1) Sidiyin sıçrayıb bədən və paltara düşməyəcəyinə əmin olduqda; 2) Nəzərdən qorunmağına əmin olduqda.

# İKİNCİ BÖLMƏ: «NAMAZ»

## Birinci fəsil: «Namazın vaxtları»

50. Əbu Amr əş-Şeybani[1] Abdullah ibn Məsudun (r.a) evini göstərib dedi: «Bu evin sahibi bizə dedi ki, mən Peyğəmbərdən (s.ə.s) hansı əməlin Allah yanında daha sevimli olduğunu soruşdum. O dedi: "Vaxtında qılınan namaz". Mən: "Sonra hansı?" – deyə soruşdum. O dedi: "Valideynlərin qayğısına qalmaq". Mən: "Sonra hansı?" – deyə soruşdum. O dedi: "Allah yolunda cihad etmək". Bundan əlavə yenə soruşsaydım, onu da mənə deyərdi» (əl-Buxari, 527; Müslim, 250).

50-ci hədisdən çıxarılan nəticələr:
– Allah yanında ən sevimli əməl vaxtında qılınan namaz, valideynlərin qayğısına qalmaq və Allah yolunda cihad etməkdir.
Qeyd: İmansız adama bunları etməyin heç bir faydası yoxdur.
– Əməllər müxtəlif dərəcələrdə olub fəzilət baxımından biri digərindən fərqlənir;
– Allahın məhəbbətinin isbatı. Bu məhəbbət Onun zatına layiq olan şəkildədir və keyfiyyəti (necəliyi) bizə məlum deyildir;
– Elm barəsində verilən sualın əfzəl olması;
Peyğəmbərdən (s.ə.s) bir neçə dəfə ən fəzilətli əməl haqqında soruşulub. O (s.ə.s), hər dəfə olduğu məqama münasib cavablar vermişdir. Deməli, hər bir əməli məqamında yerinə yetirmək əfzəl əməllərdən sayılır.

51. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) fəcr namazını[2] qılarkən, hicablarına bürünmüş mömin qadınlar da ona qoşulardı. (Namazlarını qıldıqdan) sonra isə evlərinə qayıdar və qaranlıq olduğundan heç kəs onları tanımazdı» (əl-Buxari, 578; Müslim, 1456).

51-ci hədisdən çıxarılan nəticələr:
– Sübh namazının ilkin vaxtında qılınması əfzəldir;
– Qadınların namaz qılmaq üçün məscidə gəlməsi caizdir;
– Mömin qadının hicab geyinməsi vacibdir.

[1] Adı: Səd ibn İyəs.
[2] Sübh namazı.

52. Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) günəş zeniti keçdikdə (şiddətli istidə) zöhrü, günəş saf olduqda (hələ saralmamış) əsri, günəş batdıqda da məğribi qılardı. İşanı isə, səhabələrin toplandığını gördükdə tez (vaxtı girəndə), yubandıqlarını gördükdə isə gec qılardı. Sübhü isə Peyğəmbər (s.ə.s) qaranlıqda qılardı» (əl-Buxari, 560; Müslim, 1458).

52-ci hədisdən çıxarılan nəticələr:

– Sübh, zöhr, əsr və məğrib namazlarını ilkin vaxtında qılmaq əfzəldir;

– İşa namazını isə gecənin yarısına qədər təxirə salmaq əfzəldir;

– İmam işa namazını qılmaq üçün camaatın toplanmasını və ya yubanmasını nəzərə almalıdır;

– Camaatla namaz qılmaq əfzəldir;

– Hər namazı təyin olunmuş vaxtda qılmaq əfzəldir.

53. Əbu-l-Minfəl[1] rəvayət edir ki, «Mən və atam, Əbu Bərzətə əl-Əsləminin yanına getdik. Atam ona: "Danış, görək Peyğəmbər (s.ə.s) namazları necə qılardı?» – deyə müraciət etdikdə, o dedi: "Peyğəmbər (s.ə.s) əl-Həciri[2] – sizin saydığınız ilk namazı – günəş zeniti keçdikdə qılardı. Əsri qıldıqdan sonra bizlərdən biri şəhərin kənarında yerləşən evinə qayıdar, günəş isə hələ də saralmamışdı. *Məğrib haqqında dediyi isə yadımdan çıxıbdır*[3]. "əl-Atəmətu" adlandırdığınız İşanı da gecikdirməyi xoşlayar, ondan qabaq yatmağı və ondan sonra danışmağı isə bəyənməzdi. Sübh namazını isə hər bir kəsin yanındakını seçdiyi vaxtda (hava bir az işıqlandıqda) bitirərdi. Bu namazda o, altmış ayədən yüz ayəyə qədər oxuyardı» (əl-Buxari, 547; Müslim, 1403).

53-cü hədisdən çıxarılan nəticələr:

– Namazların vaxtı Peyğəmbər (s.ə.s) tərəfindən (Allahın əmri ilə) müəyyən olunmuşdur;

– Peyğəmbər (s.ə.s) İşa namazından savayı başqa namazları ilkin vaxtında qılmışdır;

– İşa namazını gecənin yarısına qədər təxirə salmaq əfzəldir;

– İşa namazından qabaq yatmaq, sonra isə danışmaq məkruhdur (bəyənilmir).

---

[1] Adı: Səyyar ibn Sələmə.

[2] Zöhr namazının adıdır.

[3] Maili qeyd olunmuş cümlə Əbu-l-Minfəlin sözüdür.

Qeyd: İşa namazından sonra faydalı işlə məşğul olmaq (dərs hazırlamaq, kitab oxumaq və s.) müstəsnadır.

– İşa namazını «atəmətu» adlandırmaq (məkruhdur) bəyənilmir;

– Sübh namazını qıldıqda uzun surələri oxumaq müstəhəbdir.

54. Əli (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Xəndək günü[1] dedi: "Onlar (müşriklər) bizi orta namazdan[2] gün batana qədər yayındırdılar. Allah onların evlərini və qəbirlərini odla doldursun!" Sonra onu (Əsri) Məğriblə İşa arasında qıldı» (əl-Buxari, 2931; Müslim, 1424).

55. Abdullah ibn Məsud (r.a) rəvayət edir ki, «Müşriklər Peyğəmbəri (s.ə.s) günəş qızarana və ya saralana qədər Əsr namazından yayındırdılar. Bunu görən Peyğəmbər (s.ə.s) dedi: "Onlar bizi Əsr namazından yayındırdılar. Allah da onların içərilərini və qəbirlərini odla doldursun!"» (Müslim, 1425).

54-cü və 55-ci hədislərdən çıxarılan nəticələr:

– Əsr namazının orta namaz adlanması;

– İmkansızlıqdan hər hansı bir namazın vaxtından gec qılınmasının caiz olması.

Qeyd: Bu hadisə əl-Bəqərə surəsinin 239-cu ayəsi nazil olmamışdan əvvəl baş vermişdir. Bu ayə namazın vaxtından gec qılınmasının caiz olmasını nəsx[3] etmişdir. Uca Allah buyurur:

حَافِظُوا عَلَى الصَّلَوَاتِ وَالصَّلَوٰةِ الْوُسْطَىٰ وَقُومُوا لِلَّهِ قَانِتِينَ ﴿٢٣٨﴾ فَإِنْ
خِفْتُمْ فَرِجَالًا أَوْ رُكْبَانًا فَإِذَا أَمِنتُمْ فَاذْكُرُوا اللَّهَ كَمَا عَلَّمَكُم مَّا
لَمْ تَكُونُوا تَعْلَمُونَ ﴿٢٣٩﴾

«[Fərz, vacib] namazlara, xüsusilə orta namaza [günortadan sonrakı əsr namazına] riayət [əməl] edin və Allaha itaət üçün ayağa qalxın [namaza durun]. Əgər [düşməndən və ya yırtıcı heyvandan] qorxsanız [namazınızı] piyada gedə-gedə və ya minik üstə qılın. [Təhlükədən sovuşmağınıza] əmin olduqda isə Allahı, bilmədiyiniz şeyləri [namazı, duanı] sizə [Peyğəmbər və

[1] Xəndək döyüşündə.
[2] Əsr namazı.
[3] Hökmünü ləğv etmişdir.

Quran vasitəsilə] nə cür öyrədibsə, o cür anın [zikr edin, namaz qılın]» («əl-Bəqərə» surəsi, 238-239).

– Namazını unudan şəxs yadına düşən zaman onu qılmalıdır;

– Məzlumun (zülm olunanın) zalımın əleyhinə həddi aşmayaraq dua etməsi caizdir ki, bu da qisasın bir növüdür;

– Hədisi məna ilə yox, varid olduğu ləfzdə rəvayət etmək əfzəldir.

56. Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) İşa namazını gecikdirdi və bunu görən Ömər gəlib dedi: "Ey Allahın elçisi! Qadınlar və uşaqlar uzanıb (gözləməyə taqətləri yoxdur)". Peyğəmbər (s.ə.s) saçlarından su dama-dama bayıra çıxdı və dedi: "Ümmətimə – və ya insanlara – çətin olmasaydı, bu saatda namaz[1] qılmağı onlara əmr edərdim"» (əl-Buxari, 571; Müslim, 1450).

56-cı hədisdən çıxarılan nəticələr:

– İşa namazının nə zaman (əvvəl, yoxsa axır vaxtında) qılınmasının əfzəl olduğu barədə alimlər ixtilaf etmişlər;

a) Bəzi alimlər işa namazının əvvəl vaxtında qılınmasını əfzəl sayırlar. Buna dəlil olaraq Peyğəmbərin (s.ə.s) çox vaxt bu namazı əvvəl vaxtında qıldığına istinad edirlər. Peyğəmbərin (s.ə.s) bəzən bu namazı axır vaxtında qılmağını isə üzrlü hal olması, və yaxud bu əməlin caiz olması kimi qəbul edirlər.

b) Əksər alimlər bu namazın axır vaxtında qılınmasını əfzəl sayırlar və dəlil olaraq İbn Abbas (r.a) və başqa səhabələrin buna bənzər rəvayət etdiyi hədislərə istinad edirlər. O ki qaldı Peyğəmbərin (s.ə.s) çox vaxt bu namazı əvvəl vaxtında qılmasına, bunu o, namaz qıldırdığı camaata əziyyət olmasın deyə belə edərdi.

– İslam şəriətinə görə əziyyət verən əməllər əfzəl olsa belə ondan çəkinmək yaxşıdır. Uca Allah buyurur:

لَا يُكَلِّفُ اللَّهُ نَفْسًا إِلَّا وُسْعَهَا

«Allah heç kəsi qüvvəsi çatmayan işi görməyə vadar etməz…» («əl-Bəqərə» surəsi, 286);

فَاتَّقُوا اللَّهَ مَا اسْتَطَعْتُمْ

«Allahdan bacardığınız qədər qorxun» («ət-Təğabun» surəsi, 16).

---

[1] Yəni, İşa namazı.

– Peyğəmbərin (s.ə.s) ümmətinə qarşı rəhmli və şəfqətli olması;
– Qadınların və uşaqların camaatla namaz qılmasının caiz olması;
– Elmdə üstün olan şəxslərə nəsihət verməyin caiz olması.

57. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər dedi: "Şam yeməyi gətirildiyi zaman iqamə verilərsə, əvvəlcə yeməyi yeyin! (Sonra namaz qılın)"» (əl-Buxari, 5465; Müslim, 1241).

57-ci hədisdən çıxarılan nəticələr:
– Namazın vaxtı daxil olduğu zaman yemək-içmək təqdim olunarsa, öncə yeməyi yemək və ya suyu içmək, sonra isə namaz qılmaq lazımdır. Bir şərtlə ki, namazın vaxtı çıxmasın.
– İslam dininin sadə və asan olması;
– Namazdan yayındıran hər bir amildən uzaqlaşmaq.

58. Aişə (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin (s.ə.s): "Yemək gətirildiyi zaman, həmçinin öndən və arxadan çıxanı[1] dəf edərək (saxlayaraq) namaz qılınmamalıdır" – dediyini eşitdim» (Müslim, 1246).

58-ci hədisdən çıxarılan nəticələr:
– Süfrəyə yemək verildiyi zaman namaz qılmaq məkruhdur;
– Öndən və arxadan çıxanı (sidiyi və ya nəcisi) dəf edərək (saxlayaraq) namaz qılmaq məkruhdur;
– Namazdan yayındıran hər bir şeydən çəkinmək vacibdir;
– Yemək-içməyə və subaşına çıxmağa olan ehtiyac namazı təxirə salmaq (namazın vaxtını bir az gecikdirmək) üçün səbəbdir.

59. Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «(Sadiqliyində və müsəlmanlığında şəkk olmayan) bir neçə səhabə və onların arasında ən sadiq, dinində də ən möhkəm olan Ömərin (r.a) Peyğəmbərin (s.ə.s): "Sübh namazından sonra gün çıxana qədər və Əsr namazından sonra gün batana qədər namaz qılmağı nəhy[2] etdi"yini mənə xəbər verdilər» (əl-Buxari, 581; Müslim, 1918).

60. Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Sübh namazından sonra gün çıxana və Əsr namazından sonra gün batana qədər namaz qılınmamalıdır"» (əl-Buxari, 586; Müslim, 1920).

[1] Sidik və nəcis.
[2] Qadağan.

Müəllif[1] deyir ki, «Bu fəsilə dair Əli ibn Əbu Talib (r.a), Abdullah ibn Məsud (r.a), Abdullah ibn Ömər (r.a), Abdullah ibn Amr ibnu-l-As (r.a), Əbu Hüreyrə (r.a), Səmura ibn Cündəb (r.a), Sələmətu ibn əl-Əkva (r.a), Zeyd ibn Sabit (r.a), Muaz ibn Afra (r.a), Kəab ibn Murra (r.a), Əbu Sələmə əl-Bəhili (r.a), Amr ibn Abəsə əs-Suləmi (r.a), Aişə (r.a) və əs-Sunabihi[2] hədis rəvayət etmişlər.

59-cu və 60-cı hədislərdən çıxarılan nəticələr:

Bu qadağan olunmuş vaxtlarda namazların qılınması barəsində alimlərin rəyi:

1. İcma (Əbu Hənifə, Malik, Şafii, Əhməd ibn Hənbəl və s.) bu hədislərə əsaslanaraq namazların bu vaxtlarda qılınmasının məkruh (qadağan) olmasını təsdiq etmişlər.

2. Zahirilər bu hədislərin mənsux[3] olduğuna üstünlük verib, namazların bu vaxtlarda qılınmasının caiz olduğunu iddia etmişlər.

Qeyd: Fərz namazlarını üzrlü səbəbə görə bu vaxtlarda qılmaq caizdir. Bundan əlavə səbəbi olan namazları da (məscidə daxil olduqda qılınan namaz və s.) bu vaxtlarda qılmaq caizdir.

Müəllif burada yalnız iki vaxtı qeyd etmişdir:

1) Sübh namazından sonra günəş üfüqdən təxmini 3 metrə qalxana qədər.

2) Əsr namazından sonra gün batana qədər.

3) Müslimin rəvayət etdiyi hədisdə isə günəşin zenitdə olduğu vaxtın da qadağan olduğu qeyd edilmişdir.

61. Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Xəndək günü gün batdıqdan sonra Ömər (r.a) Qureyşin[4] kafirlərini söyə-söyə gəlib Peyğəmbərə (s.ə.s) dedi: "Ey Allahın elçisi! Əsr namazını gün bata-batda qıldım". (Bunu eşidən) Peyğəmbər (s.ə.s): "Allaha and olsun ki, hələ Əsr namazını qılmamışam" – deyib bizimlə bərabər Buthanə[5] gəldi, orada dəstəmaz alıb Əsr, sonra da Məğrib namazını qıldıq» (əl-Buxari, 596; Müslim, 1428).

61-ci hədisdən çıxarılan nəticələr:

---

[1] Abdul-Ğani əl-Məqdisi.
[2] Tabiindir. (Peyğəmbəri (s.ə.s) görməyib və ondan hədis eşitməyibdir).
[3] Yəni hökmdən düşmüş.
[4] Məkkədə yaşayan qəbilənin adıdır.
[5] Mədinə şəhərindəki vadinin (dərə) adıdır.

– Fərz namazlarından hər hansı biri buraxıldığı zaman onun qəzasını qılmaq vacibdir;

– Hədisin zahiri mənası Peyğəmbərin (s.ə.s) Əsr namazını unutqanlıqdan yox, əksinə, qəsdən gecikdirməsinə dəlalət edir. Lakin qeyd etmək lazımdır ki, bu hadisə qorxu namazının Allah tərəfindən bəyan olunmasından əvvəl baş vermişdir;

– Bu hədis, qəzaya qalmış namazın vaxtı daxil olmuş namazdan əvvəl qılınmasının caiz olmasına dəlalət edir. Lakin vaxtı daxil olmuş namazın qəzaya qalma ehtimalı olarsa, əvvəlcə onu qılmaq lazımdır ki, qəzaların sayı artmasın;

– Peyğəmbərin (s.ə.s) Ömərin (r.a) bu hərəkətinə etirazını bildirməməsi, zalımın əleyhinə dua edilməsinin caiz olmasına dəlalət edir;

– Tələb olunmadan and içməyin caiz olması.

## İkinci fəsil: «Camaat namazının fəziləti və onun vacib olması»

62. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Camaatla qılınan namaz, tək qılınan namazdan iyirmi yeddi dərəcə[1] (artıq) əfzəldir"» (əl-Buxari, 645; Müslim, 1475).

62-ci hədisdən çıxarılan nəticələr:

– Camaatla qılınan namazın əfzəl olması;

– Tək qılınan namazın savabının camaatla qılınan namazdan az olması;

– Tək qılınan namazın məqbul olunması.

63. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Kişinin camaatla qıldığı namazının savabı evində və bazarda tək qıldığı namazın savabından iyirmi beş dəfə artıqdır. Belə ki, o, mükəmməl şəkildə dəstəmaz alıb yalnız camaatla namaz qılmaq üçün məscidə getdiyi zaman, hər addımına bir savabı artar və bir günahı silinər. Camaatla namaz qılarsa, o namazı camaatla qıldığı yerdə gözlədiyi müddətdə mələklər onun üçün dua edib deyərlər: "Allahım, ona xeyir-dua ver! Allahım, onu bağışla! Allahım, ona rəhm et!" Camaat namazını gözlədiyi müddətdə isə camaatla namaz qılan kimi hesab olunar[2]» (əl-Buxari, 647; Müslim, 1476).

63-cü hədisdən çıxarılan nəticələr:

---

[1] Savab.

[2] Yəni, savabı eynidir.

– Məsciddə camaatla qılınan namazın əfzəl olması;

– Tək qılınan namazın savabının camaatla qılınan namazın savabından az olması;

– Camaatla namaz qılmağın şərt (yəni namazın şərtlərindən) olmaması;

– Namaz qılmaq üçün məscidə gedənin atdığı addımlara görə savab qazanması və günahlarının silinməsi;

– Fərz namazının qılınmasını gözləyən şəxsin namaz qılan şəxs qədər savab qazanması.

64. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Həqiqətən, münafiqlər üçün ən çətin sayılan namaz İşa və Sübh namazlarıdır. Halbuki onlar bu iki namazın nə dərəcədə fəzilətli olduğunu bilsələr, iməkləməli olsalar belə, bu namazı qılmağa tələsərlər. Artıq mən, bir nəfəri öz yerimə camaata namaz qıldırmaq üçün (imam) təyin edib sonra əllərində odun şələsi olan bir dəstə kişi (səhabə) ilə camaat namazına gəlməyənlərin evlərinə gedib onu[1] yandırmağı qəsd etdim» (əl-Buxari, 657; Müslim, 1480).

64-cü hədisdən çıxarılan nəticələr:

– Həddi-büluğa çatmış oğlan uşağına camaatla namaz qılmağın vacib olması;

– Üzrsüz səbəbə görə camaat namazını tərk edənin günah qazanması;

– İşa və Sübh namazlarının fəzilətli olması;

– İşa və Sübh namazlarının camaatla qılınmasının münafiqlər üçün çətin olması.

65. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Sizdən biriniz, zövcəsi məscidə getmək üçün ondan izn istədiyi zaman, ona (zövcəsinə) mane olmasın». Bunu eşidən Bilal ibn Abdullah[2]: «Allaha and olsun ki, onlara (məscidə getməyə) mane olacağıq» – dedi. Abdullah (r.a) yaxınlaşıb onu çox sərt danladıqdan sonra dedi: «Mən sənə Rəsulullahdan (s.ə.s) hədis danışıram, sən də deyirsən ki, Allaha and olsun ki, onlara mane olacağıq» (əl-Buxari, 873; Müslim, 987, 988).

Başqa rəvayətdə: «Allahın kənizlərinə (müsəlman qadınlara) məscidə getməyi qadağan etməyin!» (Müslim, 989).

65-ci hədisdən çıxarılan nəticələr:

---

[1] Onların evlərini.

[2] Bilal ibn Abdullah ibn Ömər ibni-l-Xəttab.

– Qadın məsciddə namaz qılmaq istədiyi zaman ona icazə verməyin müstəhəb olması. Bunun caiz olması isə mötəbər hədislərdə olduğu kimi iki şərtlə bağlıdır: 1) Qadının xarici görünüşünün cəlbedici olmaması; 2) Qadının fitnəyə səbəb olmaması.

– Hədisin zahiri mənası icazənin yalnız məsciddə qılınan namazla bağlı olmasına dəlalət edir. Lakin, qadının bayram (fitrə və qurban) xütbələrini dinləmək üçün məscidə getməsi vacibdir;

– Peyğəmbərin (s.ə.s) sünnəsinə etiraz edənə kəskin cavab vermək;

– Şəriət hökmünü öz fikriylə yozan şəxsə bunu ədəblə, ehtiramla və gözəl surətdə başa salmaq.

66. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Mən Peyğəmbər (s.ə.s) ilə bir yerdə Zöhrdən əvvəl və sonra, həmçinin Cümə, Məğrib və İşa namazlarından sonra da iki rükət namaz qıldım» (əl-Buxari, 937).

Başqa rəvayətdə: «Məğrib, İşa və Cümənin (iki rükət sünnə namazını) evində qılardı» (əl-Buxari, 1172; Müslim, 1695).

Başqa rəvayətdə İbn Ömər (r.a) deyir ki, Həfsa (r.a) ona rəvayət etdi ki, «Peyğəmbər (s.ə.s) fəcr daxil olduqda iki rükət xəfif (qısa) namaz qılardı. (Gün ərzində) elə bir saat var idi ki, o vaxt mən Peyğəmbərin (s.ə.s) yanına daxil olmazdım» (əl-Buxari, 1173.

66-cı hədisdən çıxarılan nəticələr:

– Hədisdə qeyd olunan ratibə namazlarının və onların müntəzəm şəkildə qılınmasının müstəhəb olması;

– Əsr namazında ratibə namazlarının olmaması;

– Məğrib, İşa, Sübh və Cümə namazlarının ratibələrini evdə qılmağın əfzəl olması;

– Sübh namazında qılınan ratibənin qısa olması.

67. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) başqa nafilə namazlarına nisbətən Fəcr namazının sünnəsinə daha çox davamlı və daha çox bağlı idi» (əl-Buxari, 1163).

Başqa rəvayətdə: «Fəcr namazının iki rükəti dünya və içindəkilərdən xeyirlidir» (Müslim, 1685).

## Üçüncü fəsil: «Azan[1]»

[1] Xüsusi kəlmələrlə namazın vaxtının daxil olmasını elan etmək.

68. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Bilal (r.a) azanın sözlərini cüt sayda, iqaməni[1] isə tək sayda deməyə əmr olundu» (əl-Buxari, 605; Müslim, 836).

68-ci hədisdən çıxarılan nəticələr:

– Azan və iqamənin namazdan əvvəl deyilməsinin vacib olması;

– Azanın sözlərinin cüt, iqamənin sözlərinin tək sayda deyilməsinin müstəhəb olması. Belə ki, azanın əvvəlində olan təkbir – Allahu əkbər – 4 dəfə, sonundakı tövhid kəlməsi – Lə iləhə illəllah (Allahdan başqa ibadətə layiq məbud yoxdur) – 1 dəfə deyilir.

İqamənin əvvəlində olan təkbir və bir də «Qad qaməti-s-salət» (Artıq namaz başladı) kəlməsi cüt sayda deyilir.

Azan və iqamə kişilər üçün fardul-kifayədir.

69. Əbu Cüheyfə – Vahb ibn Abdullah əs-Suvai (r.a) deyir ki, «Mən Peyğəmbərin (s.ə.s) yanına gəldim. O, dəridən hazırlanmış qırmızı rəngli çadırda idi. Bu vaxt Bilal (r.a) Peyğəmbərin (s.ə.s) dəstəmaz aldığı qabdakı suyu bayıra çıxartdı. Səhabələr də, xeyir-bərəkətə nail olsunlar deyə, o sudan (əlləri ilə) götürdülər. Səhabələrdən bəzilərinə su çatmadığı üçün əllərini su götürən səhabələrin əllərinə sürtdülər. Sonra Peyğəmbər (s.ə.s) (üzərində qara xətlər olan) qırmızı geyimdə çadırdan bayıra çıxdı. Mən dayanıb onun ayaqlarının (dizdən aşağı) ağlığına baxırdım. Sonra Bilal (r.a) azan verdi. O, başını sağa və sola çevirərək "namaza tələsin", "nicat tapmaq üçün tələsin" deyir, mən də onun ardı ilə (tələffüz etdiyi sözləri) təkrar edirdim. Sonra Peyğəmbər (s.ə.s) üçün (sutra[2] olsun deyə) nizəyə oxşar, ancaq onun yarısı boyda olan silah yerə sancıldı və o, (camaatla birgə) iki rükət Zöhr və iki rükət Əsr namazını qıldı[3]. Peyğəmbər (s.ə.s) Mədinəyə qayıdana qədər (dördrükətli namazları) iki rükət qıldı» (əl-Buxari, 187; Müslim, 1119).

69-cu hədisdən çıxarılan nəticələr:

– Müəzzin azan verdiyi zaman «Hayyə alə-s-salət» (Namaza tələsin) və «Hayyə alə-l-fələh» (Nicat tapmaq üçün tələsin) deyərkən başını sağa və sola döndərməsinin caiz olması;

– Səfərdə olan müddətdə dörd rükətli namazları (Zöhr, Əsr və İşa) qısaldıb iki rükət qılınması;

---

[1] Namaza durduqda oxunan xüsusi kəlmələr.
[2] Namaz qılanın önünə qoyduğu səd.
[3] Səfərdə olduğu üçün belə etdi.

– Namaz qılanın önündə sütrənin olması;

– Səhabələrin Peyğəmbəri (s.ə.s) çox sevməsi və ondan bərəkət umması.

Qeyd: Ümumiyyətlə, xeyir-bərəkətə üç yolla nail olmaq olar:

1) Allaha dua edib Ondan istəməklə;

2) Zəmzəm suyunu içməklə. Buna dəlil: Cabir ibn Abdullahdan (r.a) rəvayət olunan hədisdə Peyğəmbər (s.ə.s) demişdir: «Zəmzəm suyu, onu içən üçündür(şəfadır)» («Müsnəd», 3/357; «Səhih hədislər silsiləsi», 2/543; «İrvau-l-ğalil», 4/320, 1123-cü hədis).

3) Peyğəmbərin (s.ə.s) sağlığında onun dəstəmazının suyundan və s. xeyir-bərəkət ummaq.

– Xalis qırmızı rəngdə olmayan paltarı geyinməyin caiz olması.

Qeyd: İbnu-l-Qeyyim xalis qırmızı rəngdə olan paltarın yalnız kişilər üçün qadağan olunmasını «Zadu-l-Məad» kitabında açıqlamışdır.

70. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Həqiqətən, Bilal gecə (Fəcrdən əvvəl) azan verir. Siz Ummu Məktumun oğlu (r.a) azan verənə qədər (dan yeri ağarana qədər) yeyin, için!» (əl-Buxari, 617; Müslim, 2531).

70-ci hədisdən çıxarılan nəticələr:

– Sübh namazının vaxtının daxil olmasından bir müddət əvvəl azan verməyin caiz olması. Deməli, sübh namazı üçün iki dəfə azan verilə bilər: birincisi vaxtından əvvəl, ikincisi isə vaxtı daxil olduqda.

– Bir məsciddə azan vermək üçün iki müəzzinin təyin olunması;

– Müəzzinin kor olması onun azan verməyinə mane olmur. Çünki Umm Məktumun oğlu (r.a) kor idi;

– Ədalətli olan tək bir şəxsin verdiyi xəbərə inanıb ona əməl etmək.

71. Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Müəzzinin[1] azan verdiyini eşitdiyiniz zaman onun dediklərini (azanda deyilən sözləri) təkrar edin!» (əl-Buxari, 611; Müslim, 846).

71-ci hədisdən çıxarılan nəticələr:

– Müəzzinin dediklərini təkrar etmək (yəni müəzzin hər cümləni tamamladıqca o cümləni eşidənlər təkrar etməlidirlər);

– Yalnız «hayyə alə-s-salət» və «hayyə alə-l-fələh» cümlələrindən sonra «lə həulə va lə quvvətə illə billəh (yəni qüdrət və qüvvət yalnız Allaha məxsusdur)» demək lazımdır;

---

[1] Müəzzin – azan verən.

– Yalnız subaşına çıxan şəxs üçün bunu təkrar etmək caiz deyildir.

Cabir ibn Abdullahdan (r.a) rəvayət olunan hədisdə Peyğəmbər (s.ə.s) demişdir: «Azanı eşidib "Allahummə Rabbə həzihi-d-dəvəti-t-təamməti va-s-salətu-l-qaimə, ə’ti Muhəmmədən əl-vasilətə va-l-fadılətə va-bəashu məqamən məhmudən əlləzi vəadtəh" deyən hər bir müsəlmana Qiyamət günü şəfaətim yetişər» (əl-Buxari, 2/112, 614-cü hədis).

Duanın tərcüməsi: «Tamamlanmış bu dəvətin[1] və ödənilən namazların Rəbbi olan Allahım! Məhəmmədi vasitəçi və fəzilət sahibi et və onu (ona) vəd etdiyin həmd olunan məqama yetişdir!»

Uca Allah Qurani-kərimdə buyurmuşdur:

عَسَىٰٓ أَن يَبْعَثَكَ رَبُّكَ مَقَامًا مَّحْمُودًا ﴿٧٩﴾

«Ola bilsin ki, Rəbbin səni (Qiyamət günü hamı tərəfindən) bəyənilib təriflənən bir məqama (axirətdəki ən böyük şəfaət məqamına) yetişdirsin!» («əl-İsra» surəsi, 79).

**Dördüncü fəsil: «Qibləyə tərəf yönəlmək»**

72. İbn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) üzünü üzərinə mindiyi heyvanın getdiyi istiqamətə tutub, başı ilə işarə edərək namazını qılardı». Həmçinin İbn Ömər (r.a) də bunu edərdi. (əl-Buxari, 1105; Müslim, 1208).

Başqa rəvayətdə: «Dəvəsinin üzərində vitr namazını qılardı» (Müslim, 1613).

Başqa rəvayətdə: «Minik üzərində fərz[2] olan namazı qılmazdı» (əl-Buxari, 1097; Müslim, 1616).

72-ci hədisdən çıxarılan nəticələr:

– Səfərdə ikən, sünnət namazlarının minik üzərində qılınmasının caiz olması;

– Minik üzərində vacib olan namazın yalnız zəruriyyət halında qılınması;

– Baş ilə işarə etməklə rüku və səcdəni əvəz etmək;

---

[1] Burada tövhid – lə iləhə illəllah, Muhəmmədən rəsulullah – nəzərdə tutulur.

[2] Sübh, zöhr, əsr, məğrib və işa.

– Minik üzərində namaz qılanın qibləsinin, onun getdiyi istiqamətdə olması;

– Vitr namazının minik üzərində qılınması onun vacib namazlardan olmamasına dəlalət edir;

– İbadətlərin asanlaşdırılması Allahın hikmətindən sayılır.

73. İbn Ömər (r.a) rəvayət edir ki, «Camaat Quba məscidində[1] Sübh namazını (Qüdsə tərəf) qılarkən səhabələrdən biri gəlib onlara dedi: "Həqiqətən, bu gecə Peyğəmbərə (s.ə.s) Quran[2] nazil olub və qiblənin (Kəbəyə tərəf) dəyişdirilməsi ona əmr edilib". Camaat (namaz qıldıqları vəziyyətdə) Kəbəyə tərəf döndülər» (əl-Buxari, 4491; Müslim, 1178).

73-cü hədisdən çıxarılan nəticələr:

– İlk dəfə müsəlmanların qibləsi məscidü-l-əqsa (beytü-l-müqəddəs) idi. Sonra isə Allah onlara Qiyamətə qədər məscidü-l-hərama üz tutmağı əmr etdi;

– Ən əfzəl yer Allahın evinin yerləşdiyi məqamdır;

– Bəzi hökmlərin nəsx olunması. Bu barədə Uca Allah buyurur:

مَا نَنسَخْ مِنْ آيَةٍ أَوْ نُنسِهَا نَأْتِ بِخَيْرٍ مِّنْهَا أَوْ مِثْلِهَا ۗ أَلَمْ تَعْلَمْ أَنَّ اللَّهَ عَلَىٰ
كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿١٠٦﴾

«Biz (zaman, məkan və şəraitin tələbinə görə) hər hansı bir ayənin hökmünü ləğv edir və ya onu unutdururuqsa ondan daha yaxşısını, yaxud ona bənzərini gətiririk. Allahın hər şeyə qadir olduğunu bilmirsinizmi?» («əl-Bəqərə», 106).

– Səhvən qiblədən başqa tərəfə yönələn şəxs namazda ikən qibləyə tərəf dönə bilər. Bu halda qıldığı rükətlər səhih, mötəbər sayılır;

– Bir nəfər ədalətli şəxsin verdiyi xəbər məqbuldur.

74. Ənəs ibn Sirin rəvayət edir ki, «Ənəs ibn Malik (r.a) Şamdan qayıdarkən biz onunla Aynu-t-təmr[3] şəhərində rastlaşdıq. Mən onu uzunqulağının üzərində qiblədən sol tərəfə namaz qıldığını görüb; "Sən qibləyə tərəf namaz qılmırsan?" – deyə ondan soruşduqda o dedi:

[1] Mədinə şəhərində bina edilən ilk məscid.

[2] «Əl-Bəqərə» surəsinin 144-cü ayəsi.

[3] İraqın qərbində yerləşən şəhər.

"Peyğəmbərin (s.ə.s) belə namaz qıldığını görməsəydim belə etməzdim"» (əl-Buxari, 1100; Müslim, 1618).

74-cü hədisdən çıxarılan nəticələr:

– Səfərdə ikən, sünnət namazının minik üzərində qılınmasının caiz olması;

– Minik üzərində namaz qılanın qibləsinin onun getdiyi istiqamətdə olması.

**Beşinci fəsil: «Səflər[1]»**

75. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, Peyğəmbər dedi: «Cərgələrinizi düzəldin! Həqiqətən, cərgələrin düz olması namazın tamamlanmasındandır» (əl-Buxari, 723; Müslim, 974).

75-ci hədisdən çıxarılan nəticələr:

– Cərgələrin düz xətt şəklində düzəldilməsinin müstəhəb olması;

– Cərgələrin düzəldilməsinin namazın kamilliyindən hesab olunması;

– Cərgələrin düz olmamasının namazın naqisliyinə dəlalət edən bəyənilməyən bir hal olması;

– Camaatla qılınan namazın əfzəl olması. (Çünki yalnız camaatla qılınan namazda cərgələrin düzəldilməsinə görə savab əldə etmək mümkündür.);

Cərgələrin düzəldilməsinin hikməti Peyğəmbərdən (s.ə.s) rəvayət olunan hədisdə qeyd olunmuşdur.

Cabir ibn Səmura (r.a) rəvayət edir ki, bir gün Peyğəmbər (s.ə.s) bizə dedi: «Məgər siz mələklərin, Rəbbi yanında cərgələrə düzəldiyi şəkildə cərgələrinizi düzəltmək istəmirsiniz?» Səhabələr: «Ey Allahın elçisi! Onlar Rəbbi yanında cərgələri necə düzəldirlər?» – deyə soruşduqda, o dedi: «Əvvəlki səfdən başlayaraq cərgələri tamamlayır[2] və onları düz xətt şəklində düzəldirlər» (Müslim, 4/372, 967-ci hədis).

76. Ən-Nüman ibn Bəşir (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin (s.ə.s): "Cərgələrinizi düzəldin, yoxsa Allah da sizin üzlərinizi biri-birindən ayırar" – dediyini eşitdim» (əl-Buxari, 717; Müslim, 977).

Başqa bir rəvayətdə ən-Nüman (r.a) deyir ki, «Peyğəmbər (s.ə.s) qədəhləri[3] düzəldirmiş kimi, cərgələrimizi düzəldər və biz onun vacib olduğunu dərk edənə qədər bunu davam edərdi. Bir gün Peyğəmbər (s.ə.s)

---

[1] Cərgələr.

[2] Yəni cərgələrdə boş yer qoymurlar.

[3] Püşk atmaq üçün taxtadan düzəldilmiş oxlar.

namaza başlamamışdan əvvəl bir kişinin sinəsinin (cərgədən) qabağa çıxdığını görüb dedi: "Ey Allahın qulları! Cərgələrinizi düzəldin, yoxsa Allah da sizin üzlərinizi biri-birindən ayırar"» (Müslim, 978).

76-cı hədisdən çıxarılan nəticələr:
– Cərgələrin düz xətt şəklində düzəldilməsinin vacib olması;
– Peyğəmbərin (s.ə.s) cərgələrin düzəldilməsinə çox diqqət yetirməsi bu əməlin imamın vəzifəsindən olmasına dəlalət edir;
– Hər bir cəzanın edilən əməlin müqabilinə görə verilməsi;
– Peyğəmbərin (s.ə.s) cərgələrin əyriliyinə qəzəblənməsi, bu əməlin günah olmasına dəlalət edir;
– Azan və iqamə arasında imamın danışmasının caiz olması.

77. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Bir gün nənəm Muleykə (r.a) Peyğəmbəri (s.ə.s) yeməyə dəvət etdi. O, yeməyini yedikdən sonra dedi: "Qalxın, sizə namaz qıldırım". Mən qalxıb uzun müddət işlədilib rəngi qaralan həsirimizi su ilə təmizlədim. Peyğəmbər (s.ə.s) bu həsirin üzərində dayandı, mən və yanımdakı yetim[1] onun arxasında, nənəm də bizim arxamızda durdu. Peyğəmbər (s.ə.s) iki rükət namaz qıldıqdan sonra çıxıb getdi» (əl-Buxari, 380; Müslim, 1497).

Başqa rəvayətdə: «Peyğəmbər (s.ə.s) ona və anasına – ya xalasına – namaz qıldırdı. Ənəs (r.a) deyir ki, "O, məni sağ tərəfinə, qadını isə arxa tərəfimizə keçirtdi"» (Müslim, 1500).

77-ci hədisdən çıxarılan nəticələr:
– İcmanın rəyinə görə uşağın cərgədə dayanması səfin tamamlanmasına mane olmur;
– Bu hədis nafilə (əlavə) namaz üçün varid olub, lakin fərz namazına da şamil edilir. Elə isə yalnız nafilə namazının uşaqla bərabər (bir cərgədə) qılınmasının caiz olduğunu iddia edən şəxs tutarlı dəlil gətirməlidir;
– İmamla namaz qılanlar üçün onun arxasında dayanmaq daha əfzəldir;
– Camaatla qılınan namazda qadınlar kişilərin arxasında dayanmalıdırlar;
– Nafilə namazını camaatla qılmaq caizdir, lakin bir şərtlə ki, adət halına salınmasın;
– Təlim məqsədilə namaz qıldırmağın caiz olması;
– Peyğəmbərin (s.ə.s) təvazökar və gözəl əxlaq sahibi olması;

[1] Adı: Damiradır. O, Hüseyn ibn Abdullahın babasıdır.

– Qonaqlıq və s. təklif olunan yerə getmək müstəhəbdir. Yalnız toya çağırış olduqda getmək vacibdir ki, bu da müstəsnadır.

78. İbn Abbas (r.a) rəvayət edir ki, «Bir gün mən xalam Meymunənin (r.a) evində gecələdim. Peyğəmbər (s.ə.s) gecə namazına durduğu zaman mən gəlib onun sol tərəfində dayandım. O, mənim başımdan tutub sağ tərəfinə keçirdi» (əl-Buxari, 6316; Müslim, 1785).

78-ci hədisdən çıxarılan nəticələr:

– İmamla namaz qılan şəxs (təkdirsə) onun sağ tərəfində durmalıdır;

– İmamın sol tərəfində dayananın qıldığı namaz məqbuldur;

– İmamın namazda ikən sol tərəfində dayananı sağına keçirməsi caizdir;

– Namazın qaydasında qılınması üçün hər hansı bir hərəkət etmək onu batil etmir. Məsələn: bilməyərəkdən arxası qibləyə namaz qılan şəxsin xatırladığı zaman səmtini dəyişməsi.

– Uşaqla həddi-büluğa çatmış şəxsin bir cərgədə dayanması;

– Gecə namazının qılınmasının müstəhəb olması;

– İbn Abbasın (r.a) uşaq ikən ictihad etməsi və elmə nail olmaq üçün çalışması;

– Namazı qıldıran şəxsin imam olmaq üçün niyyət etməsi şərt deyil. Çünki, bunu nə Peyğəmbər (s.ə.s), nə də səhabələr etməyib.

## Altıncı fəsil: «İmamlıq»

79. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «İmamdan əvvəl başını (səcdədən) qaldıran qorxmur ki, Allah da onun başını – və ya surətini uzunqulağın surətinə çevirər?» (əl-Buxari, 691; Müslim, 962, 963).

79-cu hədisdən çıxarılan nəticələr:

– Namazın hərəkətlərində, oxunan surə və dualarda imamı ötməyin haram olması;

Qeyd: İmamı qabaqlamağın namazı batil etməsi barədə islam alimlərinin iki rəyi var:

1) İcmanın (Əbu Hənifə, əş-Şafii, Malik və s.) rəyinə görə bu əməl namazı batil etmir.

2) Əhməd ibn Hənbəlin, ibn Teymiyyənin və s. rəyinə görə namaz batil olur.

– Namazda imama itaət etməyin vacib olması;

– Hər hansı bir cəzanın edilən əməlin müqabilində olması;
– İmamı ötmək namazı tezliklə bitirməyə olan rəğbətə dəlalət edir.

80. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Həqiqətən, imam, namazı qıldırmaq (namaz qılanların ona itaət etməsi) üçün seçilib, ona müxalif olmayın! Təkbir[1] etdikdə təkbir, rüku etdikdə də rüku edin! "Səmi Allahu limən həmidəh[2]" dedikdə "Rabbənə və ləkəl həmd[3]" deyin! Səcdə etdikdə səcdə edin! İmam namazı oturaraq qılarsa, siz də oturmuş vəziyyətdə qılın!» (əl-Buxari, 722, 734; Müslim, 920).

81. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) xəstə ikən oturmuş vəziyyətdə evində namaz qılırdı. Arxasındakı camaatın ayaq üstə namaz qıldığını hiss edib onlara oturmaqlarını işarə etdi və namazı qılıb qurtardıqdan sonra dedi: "Həqiqətən, imam namazı qıldırmaq üçün seçilib. Rüku edərsə rüku edin, rükudan qalxdıqda siz də rükudan qalxın! "Səmi Allahu limən həmidəh" dedikdə "Rabbənə və ləkəl həmd" deyin! Namazı oturaraqq qılarsa siz də oturmuş vəziyyətdə qılın!"» (əl-Buxari, 1113; Müslim, 925).

80-ci və 81-ci hədislərdən çıxarılan nəticələr:
– Hər hansı fərz namazını qılmış şəxsin sonradan həmin namazı camaata qıldırmaq üçün onlara imamlıq etməsi barədə islam alimlərinin iki rəyi var:
1) Malikilərin və hənəfilərin rəyinə görə bunu etmək caiz deyil. Onlar bu iki hədisə və bu mənada olan hədislərə əsaslanıb belə nəticəyə gəliblər.
2) əş-Şafii, Əhməd ibn Hənbəl, ət-Təbəri, İbn Qüdamə, İbn Teymiyyə, İbnu-l-Qeyyim və s. rəyinə görə bunu etmək caizdir. Onlar Müaz ibn Cəbəlin (r.a) hədisinə əsaslanıb bu nəticəyə gəliblər. Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Müaz ibn Cəbəl (r.a) Peyğəmbər (s.ə.s) ilə birlikdə İşa namazını qılar, sonra isə gedib qövmünə İşa namazı qıldırardı» (Müslim, 4/406, 1043-cü hədis).
– İmam oturaraq namaz qılarsa, arxasındakıların hansı vəziyyətdə namaz qılmaqları barədə islam alimlərinin üç rəyi var:
1) Zahirilərin, Əvzainin və s. rəyinə görə imamın arxasındakılar, ayaq üstə durmağa qadir olsalar belə, imama tabe olub namazlarını oturaraq qılmalıdırlar. Onlar bu iki hədisə və bu mənada olan hədislərə əsaslanıb belə nəticəyə gəliblər.

---

[1] Yə‘ni, «Allahu əkbər» demək.
[2] Allah Ona həmd edəni eşitdi.
[3] Ey Rəbbimiz! Həmd yalnız Sənədir.

2) Əbu Hənifə, əş-Şafii və s. rəyinə görə imamın arxasındakılar ayaq üstə durmağa qadirdirlərsə, dayanıb namazlarını qılmalıdırlar. Onlar aşağıdakı hədisə əsaslanıb belə nəticəyə gəliblər:

Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) ömrünün sonunda xəstə ikən oturaraq, arxasındakılar isə ayaq üstə namaz qıldılar və Peyğəmbər (s.ə.s) onlara oturmağı əmr etmədi» (əl-Buxari, 2/204, 689-cu hədis).

3) Əhməd ibn Hənbəl bu iki rəyi cəm edib demişdir: Əgər imam namaza ayaq üstə başlayıb sonradan rükətlərin birində oturarsa, arxadakılara namazlarını ayaq üstə tamamlamaq vacibdir. Yox, əgər imam oturub namaza başlayarsa, o zaman arxadakıların oturaraq namaz qılması vacibdir.

– İmama tabe olmağın vacibliyi və onu qabaqlamağın haram olması;

– İmam «Səmiallahu limən həmidəh» dedikdə, arxasındakıların yalnız «Rabbənə və ləkəl həmd» deməsi;

– Namazı camaata qıldırmaq üçün imamın təyin olunmasının hikməti, ona tabe olaraq eyni şəkildə namazın qılınmasındadır;

– Zəruriyyət halında namazda olanın işarə etməsi.

82. Abdullah ibn Yezid əl-Xatmi əl-Ənsari (r.a) əl-Bəra ibn Azibdən (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) "Səmi Allahu limən həmidəh" dedikdən sonra səcdəyə gedənə qədər heç birimiz belini bükməzdi. O səcdə etdikdən sonra biz də səcdə edərdik» (əl-Buxari, 811; Müslim, 1063).

82-ci hədisdən çıxarılan nəticələr:

– Səhabələrin Peyğəmbərə (s.ə.s) müti olması;

– İmamdan tez və ya çox gec hər hansı bir hərəkətn edilməməsi.

83. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «İmam "Amin" desə, siz də deyin! Kimin "Amin" deməsi mələklərin "Amin" deməsinə müvafiq olarsa onun keçmiş günahları bağışlanar» (əl-Buxari, 780; Müslim, 912).

83-cü hədisdən çıxarılan nəticələr:

– Namazı tək və ya camaat şəklində qılanlar üçün «Amin» demək sünnədir;

– «Amin» kəlməsini demək kiçik günahların bağışlanmasına səbəbdir;

– «Amin» deyən şəxs qəlbi ilə onu dərk etməlidir;

– «Amin» kəlməsi səslə deyilməlidir. Çünki Peyğəmbər (s.ə.s) qeyd etmişdir ki, «İmam "Amin" desə…», bunu da eşitmək üçün səslə demək lazımdır;

– Mələklərin əməlinə oxşar əməl etmək ən əfzəl ibadətlərdən sayılır.

84. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Sizdən biriniz camaata namaz qıldırdıqda onu yüngülləşdirsin, çünki onların arasında zəif, xəstə və ehtiyac içində olanı var. Tək qıldığınız namazı isə istədiyiniz qədər uzadın» (əl-Buxari, 803; Müslim, 1047).

85. Əbu Məsud əl-Ənsari əl-Bədri (r.a) rəvayət edir ki, «Bir kişi Peyğəmbərin (s.ə.s) yanına gəlib dedi: "Filankəs Sübh namazını uzatdığı üçün mən o namaza gec gəlirəm". (Bunu eşidən) Peyğəmbər (s.ə.s) qəzəbləndi və mən onun belə şiddətlə qəzəblənməsini görməmişdim. (O üzünü səhabələrə tutub) dedi: "Ey insanlar! Həqiqətən, sizin aranızda (insanları) özündən uzaqlaşdıranlar var. Sizdən biriniz camaata imamlıq etdikdə namazı yüngülləşdirsin! Çünki onun arxasında duranlar arasında yaşlı, uşaq və ehtiyacı olan var"» (əl-Buxari, 7159; Müslim, 1044).

84-cü və 85-ci hədislərdən çıxarılan nəticələr:

– Camaat namazını tamamlamaq şərti ilə, onu yüngülləşdirməyin vacib olması;

– Camaat namazını uzun-uzadı qıldırana Peyğəmbərin (s.ə.s) qəzəblənməsi bu əməlin sünnəyə müxalif olmasına dəlalət edir. Qeyd etmək lazımdır ki, hərdən Peyğəmbər (s.ə.s) münasib olan yerdə namazı uzadardı.

– Namazı tək qılan şəxs, vaxtı çıxmamaq şərti ilə istədiyi qədər onu uzada bilər;

– Namaz qıldıran şəxsin xəstələri, uşaqları, körpəli qadınları, qocaları və s. aciz olanları nəzərə alması vacibdir;

– Mömin şəxs insanlar üçün onları xeyirə aparan yolu asanlaşdırmalı və onları xeyirə nail olmağa rəğbətləndirməlidir.

## Yeddinci fəsil: «Peyğəmbərin (s.ə.s) namazı»

86. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) təkbir edib (Fatihə surəsini) oxumazdan əvvəl bir az fasilə verərdi. Mən: «Ey Allahın elçisi, təkbirlə qiraət arasında verdiyin fasilədə nə oxuyursan?» – deyə soruşduqda o mənə dedi: "Allahummə bə’id bəyni və beynə xatayəyə kəmə bə’adtə bəynə-l-məşriqi və-l-məğrib. Allahummə nəqqini min xatayayə kəmə yunəqqə-s-səubul-əbyədu minə-d-dənəs. Allahummə-ğsilni min

xatayayə bil-mə’i və-s-səlci və-l-bəradi (Allahım, məşriqi[1] məğribdən[2] uzaqlaşdırdığın kimi, məni də xətalarımdan uzaqlaşdır! Allahım, ağ paltarın çirkabdan təmizləndiyi kimi məni də xətalarımdan təmizlə! Allahım, mənim xətalarımı su, qar və buz ilə təmizlə!)" duasını oxuyuram» (əl-Buxari, 744; Müslim, 1353).

86-cı hədisdən çıxarılan nəticələr:

– Namazda, təkbirdən sonra istiftah (açılış) duasını oxumağın müstəhəb olması;

– Bu duanın yalnız birinci rükətdə Fatihə surəsindən əvvəl oxunması;

– Səsli namazlarda belə (sübh, məğrib və işa) bu duanın səssiz oxunması;

– Səhabələrin Peyğəmbərin (s.ə.s) hərəkətlərinə diqqət yetirməsi. (Bu onların elmə həris olmasına dəlalət edir);

– Bu duanı çox uzatmamağın müstəhəb olması.

87. Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) təkbir və qiraətlə ("əl-həmdu lillahi Rabbi-l-aləmin" deməklə) namaza başlayardı. Rüku etdikdə başını düz tutar, yuxarı və aşağı əyməzdi. Rükudan qalxdıqda tam dikələnə qədər səcdə etməz, səcdədən qalxdıqda da rahat oturmamış yenidən səcdə etməzdi. İki rükətdən bir təhiyyatı[3] oxuyardı. (Təşəhhüdü oxuduğu zaman) sol ayağının üzərində oturub sağ ayağının barmaqlarını qibləyə tərəf yönəldər və şeytan oturuşundan[4] (səhabələrini) çəkindirərdi. Həmçinin, heyvan oturuşundan[5] da (onları) çəkindirər və namazını salam verməklə bitirərdi» (Müslim, 1110).

87-ci hədisdən çıxarılan nəticələr:

– Aişənin (r.a) Peyğəmbərin (s.ə.s) daim qıldığı namazı vəsf etməsi;

– Namazın əvvəlindən sonunadək (namazdan kənar) artıq edilən hərəkət və ya tələffüzün haram sayılması. Belə ki, bu, namazı batil edə bilər.

– Fatihə surəsini «əlhəmdülillahi Rabbil aləmin» ayəsindən başlayıb oxumaq (rükndür);

– Rüku etmək, rükudan qalxmaq, qalxdıqdan sonra dikəlmək, səcdə etmək, səcdədən qalxıb oturmaq və axırıncı təşəhhüdü oxumaq (rükndür);

– İlk təşəhhüdü oxumaq (vacibdir);

---

[1] Günçıxan.
[2] Günbatan.
[3] Təşəhhüddə salavata qədər oxunan dua.
[4] Ayaqları yana çəkib arxanı yerə vurmaq.
[5] Səcdə etdikdə dirsəkləri yerə qoymaq.

– Təşəhhüd oxunan zaman sol ayağın üzərində oturub sağ ayağın barmaqlarını qibləyə tərəf yönəltmək (sünnədir);
– Şeytan və ya heyvan kimi oturmamaq (haramdı;
– Namazı salam verməklə xətm etmək (rükndür).

88. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) namaza başladıqda, rüku etdikdə və rükudan qalxdıqda əllərini çiyinləri bərabərinə qaldırar, "Səmi Allahu limən həmidəh, Rabbənə və ləkəl həmd" duasını oxuyardı. Səcdədə isə belə etməzdi» (əl-Buxari, 735; Müslim, 860).

88-ci hədisdən çıxarılan nəticələr:
– İcmanın (əksər islam alimlərinin) rəyinə görə namaza başladıqda, rüku etdikdə və rükudan qalxdıqda əlləri qaldırmaq müstəhəbdir. Əş-Şafii, Əhməd ibn Hənbəl, İbn Teymiyyə və s. rəyinə görə üç və ya dörd rükətli namazlarda təşəhhüddən sonra üçüncü rükətə qalxdıqda da əlləri qaldırmaq müstəhəbdir. Onlar aşağıdakı hədisə əsaslanmışlar:
İbn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) ikinci rükətdən sonra qalxdıqda əllərini qaldırardı» (əl-Buxari, 2/259, 739-cu hədis).
– Əllərin çiyin bərabərinə qaldırılması.

89. İbn Abbas (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Yeddi əza üzərinə: alın – əli ilə burnuna işarə etdi, – əllər, dizlər və ayaq barmaqları üzərinə səcdə etmək mənə əmr olundu» (əl-Buxari, 809; Müslim, 1098).

89-cu hədisdən çıxarılan nəticə:
– Hədisdə qeyd olunan əzalar üzərinə səcdə etməyin vacib olması.

90. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) namaza başladıqda və rüku etdikdə təkbir[1] edər, rükudan qalxdıqda "Səmiallahu limən həmidəh", qalxıb dikəldikdə isə "Rabbənə və ləkəl həmd" deyər, sonra təkbir edib səcdə edər, yenə təkbir edib səcdədən qalxar, sonra təkbir edib bir daha səcdə edər və yenə təkbir edib səcdədən qalxardı. Həmçinin ikinci rükətdən (təşəhhüdü oxuduqdan) sonra qalxdıqda da təkbir edərdi. Peyğəmbər (s.ə.s) namazını bitirənə qədər belə edərdi» (əl-Buxari, 789; Müslim, 866).

91. Mutarrif ibn Abdullah rəvayət edir ki, «Mən və İmran ibn Hüseyn (r.a) Əli ibn Əbu Talibin (r.a) arxasında namaz qıldıq. O, səcdə etdikdə,

[1] «Allahu əkbər» demək.

səcdədən qalxdıqda və ikinci rükətdən sonra (üçüncü rükətə qalxdıqda) təkbir etdi. Namazı qılıb qurtardıqdan sonra İmran ibn Hüseyn (r.a) əlimdən tutub dedi: "Bu, mənə Məhəmmədin (s.ə.s) qıldığı namazı xatırlatdı" və ya[1] "O bizə Məhəmmədin (s.ə.s) namazını qıldırdı"» (əl-Buxari, 786; Müslim, 871).

90-cı və 91-ci hədisdən çıxarılan nəticələr:

– Namaza başladıqda və rüku etdikdə təkbir gətirmək;

– Rükudan qalxaraq «səmiallahu limən həmidəh» demək yalnız imam və təkbaşına namaz qılan üçün vacibdir;

– Rükudan qalxıb dikəldikdə «Rabbənə və ləkəl həmd» demək hər bir namaz qılana vacibdir;

– Namazı rahatlıqla qılmaq (rükndür);

– Səcdəyə getdikdə və səcdədən qalxıb oturduqda təkbir etmək ( Allahı Əkbər demək sünnətdir);

– Təşəhhüddən sonra üçüncü rükətə qalxdıqda təkbir etmək (sünnətdir).

92. əl-Bəra ibn Azib (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin (s.ə.s) qıldığı namaza diqqət etdim və qiyamda[2], rükuda, rükudan sonra dikəldikdə, səcdədə, iki səcdə arasında və sonuncu təşəhhüddə olduğu (sərf etdiyi) zamanlar bərabər olmağa yaxın idi» (Müslim, 1057).

Başqa bir rəvayətdə isə: «Qiyamda və təşəhhüddə olduğu zamandan başqa» (əl-Buxari, 792).

92-ci hədisdən çıxarılan nəticələr:

– Qiyam, rüku, rükudan qalxıb dikəldikdə, səcdə, iki səcdə arasında və sonuncu təşəhhüdə sərf olunan vaxtın bərabər olması əfzəldir.

Qeyd etmək lazımdır ki, bir çox hədislərdə qiyam və sonuncu təşəhhüdə sərf olunan vaxtın daha uzun olması varid olub. (Elə isə hər ikisini etmək caizdir)

– Səhabələrin Peyğəmbərin (s.ə.s) hər bir hərəkətinə diqqət yetirməsi.

93. Sabit əl-Bunəni rəvayət edir ki, «Ənəs ibn Malik (r.a) dedi: "Mən sizə Peyğəmbərin (s.ə.s) bizə qıldırdığı namazı qıldıracağam". Sabit deyir ki, "Ənəs (r.a) bəzi hərəkətlər edirdi ki, sizin onu etdiyinizi görmürəm. O, rükudan qalxıb dikəldikdə (dayandığı müddəti) və səcdədən qalxıb

---

[1] Bu, ravilərdən birinin etdiyi şəkdir.
[2] Ayaq üstə Fatihə və s. surələrin oxunduğu hal.

oturduqda (oturduğu müddəti) o qədər uzadardı ki, (səcdə etməyi) unutduğunu zənn edərdik"» (əl-Buxari, 800; Müslim, 1060).

93-cü hədisdən çıxarılan nəticələr:
– Rükudan sonrakı qiyamda və iki səcdə arasında olan vaxtı uzatmaq;
– Səhabələrin sünnətlərə tam riayət etməsi.

94. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin (s.ə.s) arxasında durub tam və sadə şəkildə (xəfif) qıldığım namaz kimi, heç bir imamın arxasında namaz qılmadım» (əl-Buxari, 708; Müslim, 1054).

94-cü hədisdən çıxarılan nəticələr:
– İmam, arxasında olan camaata əziyyət verməmək üçün, namazı qısa, lakin tam şəkildə (ərkanları, vacibləri və sünnələri yerinə yetirməklə) qılmalıdır;
– Peyğəmbərin (s.ə.s) qıldığı namaz kamil olduğu üçün hər bir müsəlman ona müti olmalıdır ki, çox savab və böyük müvəffəqiyyətə nail olsun.

95. Əbu Qilabə[1] rəvayət edir ki, «Bir gün Malik ibn əl-Hüveyris (r.a) bizim məscidə gəlib dedi: "Peyğəmbərin (s.ə.s) necə namaz qıldığını görmüşəmsə eləcə də sizə namaz qıldıracağam. Əyyub dedi: "Mən Əbu Qiləbədən: "O necə namaz qılıb?" – deyə soruşdum. O dedi: "Bizim şeyxin[2] qıldığı namaz kimi namaz qıldı. O, səcdədən başını qaldırdıqda, ikinci rükətə qalxmamışdan əvvəl bir müddət oturardı"» (əl-Buxari, 677).

95-ci hədisdən çıxarılan nəticələr:
– Növbəti rükətə (ikinci və ya dördüncü rükətə) qalxmazdan öncə oturmağın müstəhəb olması;
– Hər hansı əməli öyrətmək məqsədilə nümunə üçün onu göstərmək. Belə ki, bununla öyrənmək istəyən daha tez qavrayır;
– İbadəti münasib olmayan vaxtda olsa belə öyrətmək üçün göstərmək caizdir. Çünki öyrətmək, elmi çatdırmaq özü də ibadətdən sayılır.

[1] Adı: Abdullah ibn Zeyd əl-Cərmi əl-Bəsri.
[2] Əbu Yezid Amr ibn Sələmə əl-Cərmi.

96. Abdullah ibn Malik (r.a) – İbn Büheynə[1] – rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) səcdə etdikdə qollarını o qədər aralayardı ki, qoltuğunun altının ağlığı bilinərdi» (əl-Buxari, 390; Müslim, 1105).

96-cı hədisdən çıxarılan nəticələr:
– Hədisdə qeyd olunan şəkildə səcdə etmək müstəhəbdir;
– Bu qaydada səcdə etməyin çox böyük əhəmiyyəti var. Belə ki, o, insanı namazı daha çox həvəslə qılmağa rəğbətləndirir və bu cür vəziyyətdə hər bir bədən üzvü öz yerini tutur.

97. Əbu Sələmə[2] rəvayət edir ki, «Mən Ənəs ibn Malikdən (r.a): "Peyğəmbər (s.ə.s) ayaqqabıda namaz qılıbmı?" – deyə soruşduqda, o: "Bəli" – deyə cavab verdi» (əl-Buxari, 386; Müslim, 1236).

97-ci hədisdən çıxarılan nəticələr:
– Təmiz (murdar olmayan) ayaqqabı ilə namaz qılmağın müstəhəb olması;
– Təmiz (murdar olmayan) ayaqqabı ilə məscidə daxil olmağın caiz olması.

98. Əbu Qətadə əl-Ənsari (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Ümaməni (Zeynəbin qızı) qucağında tutaraq namaz qıldı» (əl-Buxari, 516; Müslim, 1212).

99. Əbu-l-As ibnu-r-Rabinin (r.a) rəvayətində isə: «Səcdə etdikdə onu (Ümaməni) yerə qoyar, ayağa qalxdıqda isə yenidən qucağına alardı» (əl-Buxari, 516; Müslim, 1212).

98-ci və 99-cu hədisdən çıxarılan nəticələr:
– Hər bir nafilə və ya fərz namazı qılan şəxsə (imama, onun arxasındakılara və tək başına namaz qılana) hədisdə qeyd olunan hərəkətləri etmək caizdir;
– Bu hədis Peyğəmbərimizin (s.ə.s) rəhmli, əxlaqlı, lətafətli və təvazökar olmasına dəlalət edir. İslam alimləri bütün dəlilləri nəzərə alıb namazda olan hərəkətləri dörd qismə bölmüşlər:
1) Namazı batil edən, haram sayılan hərəkətlər. Məs: danışmaq, qəhqəhə ilə gülmək və s.

[1] Bu ləqəblə məşhurdur.
[2] Adı: Səid ibn Yezid.

2) Namazı batil etməyən, lakin məkruh (bəyənilməyən) sayılan hərəkətlər. Məs: yuxarı baxmaq, əlləri belə qoymaq və s.

3) Ehtiyac ucundan edilən (namazı batil etməyən) hərəkətlər. Məs: bədənin hər hansı bir yerini qaşımaq, gözləri yummaq, öskürmək, asqırmaq və s.

4) Vacib olan hərəkətlər. Məs: boş cərgələri doldurmaq, «Sübhənallah» deməklə imama səhv etdiyini xatırlatmaq və s.

100. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Səcdədə bədəninizi (əl, ayaq, bel və s.) şax tutun və itin dirsəkləndiyi kimi dirsəklənməyin[1]» (əl-Buxari, 822; Müslim, 1102).

100-cü hədisdən çıxarılan nəticələr:
– Səcdəni lazımi qaydada, hədisdə qeyd olunduğu kimi yerinə yetirmək;
– İt kimi dirsəklənməmək;
– İbadətin hərəkətlərində heyvanlara oxşamamaq.

**Səkkizinci fəsil: «Rüku və səcdə zamanı olan arxayınçılığın vacibliyi»**

101. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) məscidə daxil oldu. Onun ardınca da bir nəfər məscidə daxil oldu və namaz qıldı. Sonra gəlib Peyğəmbərə (s.ə.s) salam verdi. Peyğəmbər (s.ə.s) onun salamını aldıqdan sonra ona dedi: "Qayıt, namazını qıl! Sən namaz qılmadın". O kişi gedib əvvəl qıldığı kimi namaz qıldı, sonra gəlib Peyğəmbərə (s.ə.s) salam verdi. Yenə Peyğəmbər (s.ə.s) onun salamını aldıqdan sonra ona dedi: "Qayıt, namazını qıl! Sən namaz qılmadın". Üçüncü dəfə də bu hal təkrar olunduqdan sonra o kişi dedi: "Səni haqq ilə göndərən Allaha and olsun ki, başqa cür namaz qıla bilmirəm, mənə (düzgün) namaz qılmağı öyrət". Peyğəmbər (s.ə.s) ona dedi: "Namaza başladığın zaman təkbir et. Sonra bacardığın qədər Quran ayələrindən oxu. Sonra rüku et və tam rahat olana qədər o vəziyyətdə qal. Sonra rükudan qalx və dikəl. Sonra səcdə et və tam rahat olana qədər o vəziyyətdə qal. Sonra səcdədən qalx və tam rahat vəziyyətdə otur. Daha sonra isə bu etdiklərini qalan rükətlərdə təkrar et» (əl-Buxari, 793; Müslim, 883).

101-ci hədisdən çıxarılan nəticələr:

[1] Səcdə zamanı dirsəkləri yerə qoymaq.

– Bu hədisdə qeyd olunan hər bir əməl namazın ərkanlarından sayılır və onlardan birini tərk edənin namazı batil olur;

– Hədisdə qeyd olunan hərəkətləri hər bir rükətdə təkrar etmək lazımdır;

– Bu hərəkətlərin ardıcıl yerinə yetirilməsi də namazın ərkanlarındandır. Peyğəmbərin (s.ə.s) hər iki hərəkəti «sonra» kəlməsi ilə bir-birinə bağlaması buna dəlalət edir;

– Hətta bilməyərəkdən bu hərəkətlərdən birini tərk etmək namazı batil edir. Çünki Peyğəmbər (s.ə.s) bilməyərəkdən bunu edənə qayıdıb namazını təkrar qılmağını əmr etdi;

– Cahil (elmsiz) olan şəxs namazı qıldığı zaman onun ərkanlarını yerinə yetirməklə kifayətlənə bilər. Lakin, qeyd etmək lazımdır ki, namazın vaciblərini və sünnələrini də öyrənmək onun borcudur;

– Bu hədis tərbiyəvi əhəmiyyətə malikdir. Belə ki, hər bir müəllim tələbəsinə bacarmadığı bir işi əmr etməməli, hətta bacardığı işi belə əmr etdiyi zaman gözəl üslubla ona başa salmalıdır;

– Hər hansı bir məsələ haqqında soruşulduqda ona ətraflı cavab vermək müstəhəbdir;

– İstiftahı (təkbirlə Fatihə surəsinin arasında oxunan dua), istiazəni (təşəhhüd və salavatdan sonra oxunan dua) oxumaq, əlləri qaldırmaq və onları sinə üzərinə qoymaq müstəhəbdir;

– Müəllimin tələbəyə, əvvəlcə ən mühüm sayılan əməlləri öyrətməsi.

İslam alimləri namazda oxunan surələrin miqdarı barəsində ixtilaf etmişlər.

a) Hənəfi məzhəbinin rəyinə görə Qurandan müyəssər olan qədər oxumaq kifayətdir. Onlar dəlil olaraq «Müzzəmmil» surəsinin 20-ci ayəsinə əsaslanmışlar. Uca Allah bu ayədə buyurur:

فَاقْرَءُوا مَا تَيَسَّرَ مِنَ الْقُرْآنِ

«Qurandan sizə müyəssər olanı oxuyun (təhəccüd namazı sizə vacib olmadığı üçün gecələr onu imkanınız çatdığı qədər qılıb Quran oxuyun)».

b) İcmanın (əş-Şafii, Malik, Əhməd və s.) rəyinə görə Fatihə surəsinin daima oxunması vacibdir (rükndür). Onlar dəlil olaraq Peyğəmbərin (s.ə.s) hədislərinə əsaslanmışlar. Übadə ibnu-s-Samit rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Fatihə surəsi oxunmadan qılınan namaz batildir"» (əl-Buxari, 2/276, 756-cı hədis; Müslim, 4/322, 872-ci hədis). Qeyd etmək lazımdır ki, bu daha mötəbər sayılan rəydir. O ki qaldı Hənəfi məzhəbinin əsaslandığı ayəyə, bu ayə gecə namazı üçün nazil olmuşdur.

**Doqquzuncu fəsil: «Namazda mütaliə»**

102. Übadə ibnu-s-Samit (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "(Namazın hər hansı bir rükətində) "Fatihə" surəsini oxumayanın namazı batildir"» (əl-Buxari, 756; Müslim, 872, 873).

102-ci hədisdən çıxarılan nəticələr:

– Fatihə surəsinin namazın hər bir rükətində oxunması (rükndür);

– Bilməyərəkdən, qəsdən və yaxud da unudub Fatihə surəsini oxumayanın (oxumadığı) rükətinin batil olması.

İslam alimləri imamın arxasında dayananların Fatihə surəsini oxuyub-oxumamaları barədə ixtilaf etmişlər:

a) Şafii məzhəbi və hədis əhlinin rəyinə görə imamın arxasında duranlar üçün səsli və səssiz qılınan namazda Fatihə surəsini oxumaq vacibdir. Onlar bu və buna oxşar hədislərə əsaslanmışlar.

b) Hənbəli və Hənəfi məzhəblərinin rəyinə görə isə imamın bu surəni oxuması kifayətdir. Onlar «əl-Əraf» surəsinin 204-cü ayəsinə əsaslanmışlar. Uca Allah bu ayədə buyurur:

وَإِذَا قُرِئَ الْقُرْآنُ فَاسْتَمِعُوا لَهُ وَأَنصِتُوا لَعَلَّكُمْ تُرْحَمُونَ ﴿٢٠٤﴾

«Quran oxunan zaman onu dinləyin və susun ki, bəlkə, rəhm olunasınız!».

Doğrusunu Allah bilir!

103. Əbu Qətadə əl-Ənsari (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Zöhr namazının birinci iki rükətində (hər rükətdə) "Fatihə" və başqa surələr oxuyar, birinci rükəti uzun, ikincini isə qısa edərdi. Üçüncü və dördüncü rükətlərdə isə yalnız "Fatihə" surəsini oxuyardı. Həmçinin, sübh namazının birinci rükətini uzadar, ikinci rükətini isə qısa edərdi» (əl-Buxari, 759; Müslim, 1012).

103-cü hədisdən çıxarılan nəticələr:

– Zöhr və Əsr namazlarının 1-ci və 2-ci rükətində Fatihə surəsindən sonra hər hansı bir surəni oxumaq müstəhəbdir;

– Zöhr və Əsr namazlarının 3-cü və 4-cü rükətində isə yalnız Fatihə surəsini oxumaq kifayətdir;

– Zöhr və Əsr namazlarında hər bir növbəti rükətin əvvəlkindən daha qısa olması müstəhəbdir.

Qeyd etmək lazımdır ki, əvvəlki başlıqlarda olan hökmlər Sübh, Məğrib və İşa namazlarına da aiddir.
– Zöhr və Əsr namazlarını səssiz qılmaq sünnətdir;
– Öyrətmək məqsədilə bu namazlarda hər hansı bir ayəni (surənin əvvəlindən ortasından və ya sonundan) səslə oxumaq caizdir.

104. Cübeyr ibn Mutim (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin (s.ə.s) Məğrib namazında "Tur" surəsini oxuduğunu eşitdim» (əl-Buxari, 765; Müslim, 1035).

104-cü hədisdən çıxarılan nəticələr:
– Məğrib namazını səslə qılmaq sünnətdir;
– Bu namazda uzun surə oxumaq caizdir.

105. əl-Bəra ibn Azib (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) səfərdə ikən işa namazını qıldı və iki rükətdən birində "Tin" surəsini oxudu. Mən onun kimi gözəl səslə – və ya qiraətlə – oxuyan dinləməmişdim» (əl-Buxari, 769; Müslim, 1039).

105-ci hədisdən çıxarılan nəticələr:
– İşa namazında qısa surələr oxumaq caizdir;
– Səfərdə qılınan namazları yüngülləşdirmək daha əfzəldir;
– Namazda oxunan surələri gözəl səslə oxumaq təqvanı (Allaha qarşı olan qorxunu) artırır və yatmış qəlbi oyadır.

106. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) səhabələrdən birini dəstə başçısı təyin edib döyüşə göndərdi. Səhabələr onun qıldırdığı hər bir namazı "İxlas" surəsi ilə bitirdiyini Peyğəmbərə (s.ə.s) xəbər verdilər. O dedi: "Ondan nə üçün belə etdiyini soruşun". Səhabələr ondan (nə üçün belə etdiyini) soruşduqda, o dedi: "Bu surə Rəhmanın sifətlərini şamil edir və mən də onu oxumağı çox sevirəm". Peyğəmbər (s.ə.s) dedi: "Ona deyin ki, Allah-təala da onu sevir"» (əl-Buxari, 7375; Müslim, 1887).

106-cı hədisdən çıxarılan nəticələr:
– Hər hansı bir namazda Fatihə surəsindən sonra qısa surələrdən oxumagın caiz olması;
– İxlas surəsinin çox vaxt namazda oxunmasının müstəhəb olması;
– Əməllərin savabının niyyətə görə yazılması;
– Əmr sahiblərinin elm və fəzilətli insanlardan olması;
– Allahın sifətlərini sevəni Allah da sevər;

– Quranda olan surələrin birinin digərindən fəzilət baxımından üstün olması.

107. Cabir (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Müaza (r.a) dedi: "Yaxşı olar ki, camaata namaz qıldırdıqda arxanda duranların arasında qoca, zəif və ehtiyacı olanı nəzərə alıb "Əla", "Şəms" və "Leyl" kimi surələr oxuyasan"» (əl-Buxari, 705).

107-ci hədisdən çıxarılan nəticələr:
– İmamın, arxasında dayanan qocaları, uşaqları və ehtiyacı olanları nəzərə alması;
– Peyğəmbərin (s.ə.s) səhabələri gözəl tərzdə öyrətməsi.

**Onuncu fəsil: «"Bismilləhir-rahmənir-rahim"i səslə oxumamaq»**

108. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s), Əbu Bəkr (r.a) və Ömər (r.a) namaza "əlhəmdu lilləhi rabbi-l-aləmin"[1] ayəsi ilə başlayardılar» (əl-Buxari, 743).

Başqa rəvayətdə Ənəs ibn Malik (r.a) deyir ki, «Peyğəmbər (s.ə.s), Əbu Bəkr (r.a), Ömər (r.a) və Osman (r.a) ilə namaz qıldım, onlardan heç birinin "bismilləhi-r-rahməni-r-rahim"i səslə oxuduğunu eşitmədim» (Müslim, 888).

109. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s), Əbu Bəkr (r.a), Ömər (r.a) və Osman (r.a) ilə namaz qıldım və onların hər birinin namaza "əlhəmdu lilləhi rabbi-l-aləmin" ayəsi ilə başlamasının şahidi oldum. Onlar "bismilləhi-r-rahməni-r-rahim"i mütaliənin nə əvvəlində, nə də sonunda oxumazdılar» (Müslim, 890).

108-ci və 109-cu hədislərdən çıxarılan nəticələr:
– İstiazədən (əuzu billəhi minə-ş-şeytani-r-rəcim)[2] sonra «bismilləhi-r-rahməni-r-rahim» duasını oxumaq müstəhəbdir;
– «bismilləhi-r-rahməni-r-rahim» duası səsli namazda da səssiz oxunmalıdır.

**On birinci fəsil: «Səhv səcdəsi»**

---

[1] Tərcüməsi: Bütün həmdlər yalnız aləmlərin Rəbbi Allah üçündür!
[2] Tərcüməsi: Lənətlənmiş şeytandan Allaha sığınıram!

110. Məhəmməd ibn Sirin deyir ki, Əbu Hüreyrə (r.a) ona, Peyğəmbərin (s.ə.s) aşiy[1] namazlarından birini qıldırdığını rəvayət edib, lakin hansı namaz olduğu onun yadından çıxıb. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) bizə iki rükət namaz qıldırıb salam verdikdən sonra sanki qəzəbli halda məsciddəki ağac parçasına söykəndi. Sonra sağ əlinin barmaqlarını sol əlinin barmaqlarına keçirtdi və sağ yanağını sol əlinin arxası üzərinə qoydu. Bir neçə nəfər "Namaz qısaldı?" deyib, məsciddən bayıra çıxdı. Əbu Bəkr (r.a) və Ömər (r.a) Peyğəmbərə (s.ə.s) söz deməyə cürət etmədilər. Səhabələrdən Zu-l-Yədəyn(r.a) adlı, qolları uzun olan birisi (r.a) Peyğəmbərdən (s.ə.s) "Unutdun, yoxsa namaz qısaldı?" – deyə soruşduqda, o: "Unutmadım və namaz da qısalmadı" – dedi, sonra üzünü səhabələrə tutub: "Zu-l-Yədəyn dediyi düzdür?" – deyə soruşdu. Onlar: "Bəli" – deyə cavab verdilər. Peyğəmbər (s.ə.s) qalxıb tərk etdiyi iki rükəti camaata qıldırdı və salam verdi. Sonra təkbir edib səcdə etdi, yenə təkbir edib səcdədən qalxdı, sonra yenə təkbir edib səcdə etdi, daha sonra təkbir edib səcdədən qalxdı və salam verdi» (əl-Buxari, 482; Müslim, 1288).

110-cu hədisdən çıxarılan nəticələr:

– Səhv səcdəsi üç halda edilir: 1) hərəkət və ya kəlmə namaza əlavə olunduqda, 2) həmçinin naqisləşdirildikdə, 3) şəkk-şübhə olanda.

– Peyğəmbərlərin səhv etməsi mümkündür. Belə ki, onların etdiyi səhvdə hikmət vardır:

a) belə səhvlər yalnız hərəkətlərdə baş verir. Bu da ona görədir ki, hər bir səhv edən müsəlmana xətasını necə düzəltməsi ona bəyan olsun. Bu da onların sünnəsindən sayılır.

b) Peyğəmbərlər təbliğ etdikləri kəlmələrdə səhv etmirlər.

– Namazın tamamlandığını zənn edərək onu bitirənin qıldığı rükətlər batil olmur;

– Namazı tamamladıqdan sonra danışmaq onu batil etmir;

– Səhvən və ya unudaraq namazda xəta etmək (əlavə etmək və ya naqisləşdirmək) onu batil etmir;

– Namazda səhv edən, iki dəfə səcdə etməlidir;

– İmam səhv səcdəsi edərsə ona tabe olanlar(namazda) da bunu etməlidirlər;

– Səhv səcdəsindən sonra təşəhhüdü oxumaq sünnəyə müvafiq deyildir.

[1] Günəş zeniti keçdikdən sonra gün batana qədər olan vaxtda qılınan namaz (zöhr və ya əsr).

111. Abdullah ibn Büheynə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Zöhr namazını qılarkən ikinci rükətdən sonra təşəhhüdə oturmayıb üçüncü rükətə qalxdı və camaat da onunla bərabər qalxdı. Namazı qılıb qurtardıqda, salam verməmişdən əvvəl təkbir edərək iki dəfə səhv səcdəsi etdi, sonra da salamları verdi» (əl-Buxari, 1224; Müslim, 1270).

111-ci hədisdən çıxarılan nəticələr:
– Namazda ilk təşəhhüdü tərk edənə səhv səcdəsi etmək vacibdir;
– İlk təşəhhüd namazın ərkanlarından sayılmır. Çünki belə olsa idi Peyğəmbər (s.ə.s) səhv səcdəsi ilə kifayətlənməz və tərk etdiyinə görə bir rükət də əlavə qılardı;
– Səhabələrin də ilk təşəhhüdü tərk etməsi imama (Peyğəmbərə) tabe olmağın əhəmiyyətinə dəlalət edir;
– Bu cür halda səhv səcdəsi salamdan öncə yerinə yetirilməlidir;
– Səhv səcdəsindən sonra dərhal salam verilməli və heç bir dua, təşəhhüd oxunulmamalıdır;
– Bildiyimiz kimi, qəsdən edilən səhv namazı batil edir. Lakin imamın arxasındakılar ona tabe olaraq qəsdən etdikləri xətaya görə yalnız səhv səcdəsi edir və qıldıqları rükətlər də batil olmur. Çünki hər bir xətaya görə imam məəsuliyyət daşıyır.
Qeyd: Bu səhv, namazın rüknlərində olmamalıdır.

## On ikinci fəsil: «Namaz qılanın önündən keçmək»

112. Əbu Cuheym[1] (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Namaz qılanın önündən keçən, etdiyi əməlin nə dərəcədə günah sayıldığını bilsəydi qırx (gün, və ya ay, və ya il) gözləyər və onun önündən keçməzdi"». Əbu-n-Nadr[2] deyir ki: «Bilmirəm, qırx gün dedi, yoxsa qırx ay, yoxsa da qırx il» (əl-Buxari, 510; Müslim, 1132).

112-ci hədisdən çıxarılan nəticələr:
– Namaz qılanın önündən keçmək haramdır. Yalnız onun və ya önündəki sütrənin arxasından keçmək caizdir;
– Keçidlərdə sütrəsiz namaz qılmaq bəyənilmir.

---

[1] Adı: Abdullah ibnu-l-Haris ibnu-s-Simmə.
[2] Adı: Haşim ibnu-l-Qasim əl-Leysi əl-Xorasani.

113. Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, «Peyğəmbərin (s.ə.s): "Sizdən biriniz namaz qıldığı zaman önünə sütrə qoysun! Bundan sonra isə önündən keçmək istəyəni əli ilə dəf etsin, keçməyə cəhd edərsə onunla mübarizə aparsın, çünki artıq o, şeytandır" – dediyini eşitdim» (əl-Buxari, 509; Müslim, 1128).

113-cü hədisdən çıxarılan nəticələr:

– Namaz qılan şəxs namazı batil olmasın və ya savabı azalmasın deyə önünə sütrə qoymalıdır;

– Namaz qılan şəxs önündən keçmək istəyənə mane olmaq üçün sütrəyə yaxın mövqe tutmalıdır;

– Namaz qılanın önündən keçmək şeytan əməlindən sayılır;

– Namaz qılan şəxs onun önündən keçəni işarə və ya əli ilə dəf etməlidir;

– Namaz qılan şəxs dəf olunanın aldığı xəsarətə görə (ayağı burxulsa, qolu sınsa və s.) məsuliyyət daşımır;

– Dəf etməyin hikməti ondadır ki, namaz qılan və önündən keçən günah qazanmasın;

– Birinci dəfədən şiddətlə dəf etmək caiz deyildir;

– Namaz qılan şəxsə artıq önündən keçmiş şəxsi geriyə qaytarması caiz deyildir.

114. Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Minada[1] camaatla namaz qılarkən mən – artıq yetkinlik çağına çatmışdım – dişi eşşəyin üzərində gəlib bəzi səflərin arasından (önündən) keçdim və eşşəyi otlamağa buraxdıqdan sonra (namaz qılmaq üçün) səfə daxil oldum. Etdiyim hərəkətə görə də heç kəs məni günahlandırmadı» (əl-Buxari, 493; Müslim, 1124).

114-cü hədisdən çıxarılan nəticələr:

– İmamla qılınan camaat namazında, (eşşək üzərində və s. halda) cərgələrin önündən keçmək orada olanların namazlarını batil etmir;

– Bu hadisə baş verdiyi zaman artıq Abdullah ibn Abbas (r.a) həddi-büluğa çatmışdı;

– Peyğəmbərin (s.ə.s) hər hansı bir (ibadət məqsədilə olunan) əməli təsdiq etməsi onun sünnəsindən sayılır. Burada da İbn Abbasın (r.a) etdiyi hərəkəti inkar etməməsi iki şeyə dəlalət edir. a) namazın batil olmamasına, b) imamla qılınan namazda cərgələrin önündən keçməyin caiz olmasına;

---

[1] Məkkə yaxınlığında olan vadinin adıdır.

– İmam, arxasındakılar üçün sütrə sayılır.

115. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) təhəccüd (gecə) namazını qılarkən mən onun önündə (evimizin kiçik olduğu üçün) ayaqlarımı qibləyə tərəf uzadıb uzanmışdım. O, səcdə etdikdə əllərini ayaqlarıma toxundurar, mən də ayaqlarımı yığardım, səcdədən qalxdıqda isə yenə ayaqlarımı uzadardım. O zamanlar evlərdə işıq da yox idi» (əl-Buxari, 382; Müslim, 1145).

115-ci hədisdən çıxarılan nəticələr:
– Dar yerdə uzanan şəxsin önündə namaz qılmaq caizdir;
– Belə vəziyyətdə uzanan şəxs qadın olsa belə namaz batil olmur və (namaz qılanın) savabından da azalmır;
– Qadına toxunduqda dəstəmaz pozulmur.

Namaz qılanın önündən qadının, qara itin və eşşəyin keçməsilə namaz batil olurmu?
a) İcmanın (Əbu Hənifə, Malik, Şafii və s.) rəyinə görə namaz batil olmur.
b) Əhməd ibn Hənbəl və İbn Həzmin rəyinə görə namaz batil olur.
Qeyd etmək lazımdır ki, birinci rəy daha mötəbər sayılır.

## On üçüncü fəsil: «Ümumilik»[1]

116. Əbu Qatədə əl-Ənsari[2] (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Sizdən biriniz məscidə daxil olduqda iki rükət namaz qılmamış oturmasın"» (əl-Buxari, 1167; Müslim, 1651).

116-cı hədisdən çıxarılan nəticələr:
– İki rükət məscid namazı qılmaq müstəhəbdir. Zahiri məzhəbinin rəyinə görə isə, bu, vacibdir. Lakin, qeyd etmək lazımdır ki, vacib olan yalnız beş vaxt namazdır: Sübh, Zöhr, Əsr, Məğrib və İşa namazları.
– Bu namaz istənilən vaxt, məscidə daxil olduqda qılınır;
– İslam alimləri qeyd etmişlər ki, yalnız Məkkədə «Məscidü-l-hərama» daxil olduqda təvaf etmək bu namazı əvəz edir;

---

[1] Yəni, bir neçə mövzu ilə bağlı şəriət məsələlərinin bir fəsil (ünvan) altında dərc olunması.
[2] Adı: əl-Haris ibn Rabi.

– Məscidə daxil olmaq istəyən üçün dəstəmaz almaq müstəhəbdir.

117. Zeyd ibn Ərqam (r.a) rəvayət edir ki, «Biz İslamın əvvəlində namaz əsnasında danışardıq. Bu hal ayə («əl-Bəqərə» surəsi, 238) nazil olana qədər davam etdi. (Bu ayədə Uca Allah buyurur):

حَافِظُوا عَلَى الصَّلَوَاتِ وَالصَّلَوٰةِ الْوُسْطَىٰ وَقُومُوا لِلَّهِ قَانِتِينَ ﴿٢٣٨﴾

"Namazlara, xüsusilə də orta namaza (əsr namazı) riayət edin və Allaha itaət etmək üçün ayağa qalxın və sükutla namaz qılın!". Beləliklə, sükutla namaz qılmaq və namaz əsnasında danışmamaq bizə əmr olundu» (əl-Buxari, 4534; Müslim, 1203).

117-ci hədisdən çıxarılan nəticələr:

– İslamın əvvəlində namaz əsnasında ehtiyac ucundan danışmağın caiz olması;

– «əl-Bəqərə» surəsinin 238-ci ayəsi nazil olmaqla namaz əsnasında danışmağın haram olması.

– Unutqanlıqdan və bilməyərəkdən danışanın namazı batil olmur;

– Namaza aid olmayan artıq kəlmə tələffüz etmək namazı batil edir;

– Bu hədis istənilən şəriət hökmünün nəsx (ləğv) olunmasının yəqinliyinə dəlalət edir.

Nasix (hökmü ləğv edənin) və mənsuxun (hökmü və ya ləfzi ləğv olunmuşun) növləri:

1) Ayənin başqa bir ayəni nəsx etməsi.

Buna misal: İslam dininin ilk vaxtlarında şərab içmək qadağan olunmamışdır. (Bax: əl-Bəqərə, 219 və ən-Nisa, 43). Sonra Uca Allah əl-Maidə surəsinin 90-cı ayəsini nazil etməklə əvvəl rüxsət verilmiş ayələrin hökmünü nəsx etdi.

2) Ayənin hədisi nəsx etməsi.

Buna misal: İslam diniin ilk vaxtlarında namaz əsnasında danışmaq qadağan olunmamışdı. Sonra Uca Allah «əl-Bəqərə» surəsinin 238-ci ayəsini nazil etməklə əvvəl rüxsət verilmiş hökmü nəsx etdi.

3) Hədisin başqa bir hədisi nəsx etməsi.

Buna misal: İslam dininin ilk vaxtlarında siğə (sonradan boşanmaq niyyəti ilə müvəqqəti nikah bağlamaq) qadağan olunmamışdı. Lakin

Xeybər döyüşündə, sonra bir daha Məkkənin fəthi günü Peyğəmbərin (s.ə.s) əmri[1] ilə əvvəl rüxsət verilmiş bu hökm nəsx olundu.

Məhəmməd ibn Əli rəvayət edir ki, «O, atası Əli ibn Əbu Talibin (r.a) İbn Abbasa (r.a) «Peyğəmbərin (s.ə.s) Xeybər günü mutanı və eşşək ətini yeyilməsinin qadağan etməsini» xəbər verdiyini eşitmişdir» (Müslim, «Nikah» bölməsi, 9/193, 3421).

Qeyd etmək lazımdır ki, Peyğəmbər (s.ə.s) müvəqqəti rüxsət verilmiş hər hansı hökmü bir dəfə də olsun belə əməl etməmişdir.

118. Abdullah ibn Ömər (r.a) və Əbu Hüreyrə (r.a) rəvayət edirlər ki, «Peyğəmbər (s.ə.s) dedi: "İstinin şiddətli vaxtı hava soyuyana qədər namaz (zöhr namazını) qılmayın. Həqiqətən, (bu hava) Cəhənnəmin isti havasındandır"» (əl-Buxari, 533; Müslim, 1394).

118-ci hədisdən çıxarılan nəticələr:

– Zöhr namazını, şiddətli istidə hava sərinləşənə qədər, vaxtını ötürməmək şərtilə təxirə salmaq caizdir;

– Bu əməlin hikməti namaz qılanın rahatlığındadır. Belə ki, şəriət, namazın arxayınlıqla qılınmasına rüxsət vermişdir;

– Bu hökm həm camaatla, həm də təkbaşına qılınan namaza şamil edilir;

– Namaz qılan onu yayındıran hər bir amildən uzaq olmalıdır.

119. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s): "Namazını unudan onu yadına saldığı zaman qılsın! Unutduğu namazın cəriməsi belədir" – deyib bu ayəni oxudu:




"Məni yad etmək üçün namaz qıl!"[2]» (əl-Buxari, 597).

Başqa rəvayətdə: «Namazı unudanın və ya yatıb qalanın (namaz) cəriməsi, yadına düşdüyü zaman onu qılmasıdır» (Müslim, 1558).

119-cu hədisdən çıxarılan nəticələr:

– Namazı unudan şəxs xatırladıqda, yatıb qalan isə oyandıqda onun qəzasını dərhal qılmalıdır;

– Üzrlü səbəbə görə namazı vaxtında qılmayana günah yazılmır.

---

[1] Uca Allah buyurur: «O, kefi istəyəni havadan danışmır. O, ancaq Allah tərəfindən nazil olan bir vəhydir» («ən-Nəcm» surəsi, 3-4).

[2] «Ta ha» surəsi, 14-cü ayə.

Qeyd etmək lazımdır ki, bu səbəblər artıq hədislərdən bizə məlumdur. Belə ki, insanın istədiyi səbəb üzrlü hesab oluna bilməz.

120. Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Müaz ibn Cəbəl (r.a) Peyğəmbər (s.ə.s) ilə İşa namazı qılar, sonra da qövmünə qayıtdıqda bu namazı onlara qıldırardı» (əl-Buxari, 700; Müslim, 1040).

120-ci hədisdən çıxarılan nəticələr:

– Nafilə niyyəti ilə fərz namazı qılanlara imamlıq etməyin caiz olması;

– Fərz niyyəti ilə nafilə namazı qılanlara imamlıq etməyin xüsusən caiz olması;

– Lazım gəldikdə fərz namazını iki dəfə qılmağın caiz olması.

121. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Biz şiddətli istidə Peyğəmbər (s.ə.s) ilə namaz qılardıq. Yer isti olduğu üçün səhabələrdən bəziləri paltarının qolunu çəkib üzərinə səcdə edərdi» (əl-Buxari, 1208; Müslim, 1406).

121-ci hədisdən çıxarılan nəticələr:

– Peyğəmbərin (s.ə.s) səhabələrlə şiddətli istidə Zöhr namazını qılması. Qeyd etmək lazımdır ki, bu hədislə əvvəldə keçmiş 118-ci hədisi cəm etmək mümkündür. Belə ki, Zöhr namazını şiddətli istidə qılmaq caiz, təxirə salmaq isə əfzəldir. Həmçinin bu hədisdə torpağın şiddətli istisi, 118-ci hədisdə isə havanın şiddətli istisi qəsd olunur.

– Paltarın qolunun, ətəyinin və s. üzərinə səcdə etmək caizdir. Belə ki, yalnız ehtiyac olduqda (istidə, soyuqda, tikanlıqda və s.) bunu etmək caizdir.

122. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Sizdən biriniz çiynini örtməyən bir paltarda namaz qılmasın!"» (əl-Buxari, 359; Müslim, 1151).

122-ci hədisdən çıxarılan nəticələr:

– Namazda çiyinlərin örtülü olması barədə alimlərin rəyi aşağıdakı kimidir:

a) Əhməd ibn Hənbəlin rəyinə görə namazda çiyinləri örtmək vacibdir. O, bu hədisə əsaslanmışdır.

b) İcmanın (Əbu Hənifə, Malik, Şafii və s.) rəyinə görə namazda çiyinləri örtmək əfzəl və müstəhəbdir (bəyənilləndir). Onlar əl-Buxarinin verdiyi hədisə əsaslanmışlar: Səid ibnu-l-Haris (r.a) rəvayət edir ki,

«Peyğəmbər (s.ə.s) onun paltarına baxıb demişdir: "Geniş olarsa, ona bürün (göbəkdən yuxarı və aşağı olan yerləri örtmək), dar olarsa yalnız övrət yerini (göbəkdən dizə qədər) ört!"» (əl-Buxari, 1/563, 361-ci hədis).

– Müsəlmanın namaz qılan gözəl görünüşlü olması bəyənilən haldır.

123. Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Sarımsaq və ya soğan yemiş şəxs məscidimizə yaxınlaşmayıb evində otursun!" Sonra ona bir qab tərəvəz gətirdilər. Peyğəmbər (s.ə.s) ondan iy gəldiyini hiss etdikdə onun nə olduğunu soruşdu və ona bunun tərəvəz olduğu xəbər verildi. O, bu tərəvəzi yanındakı səhabələrə verilməsini əmr etdi, özü isə ondan yemədi. (Əbu Əyyub əl-Ənsari) onun tərəvəzi bəyənmədiyini görüb haram olduğunu zənn etdi və yemədi. Peyğəmbər (s.ə.s) də ona dedi: "Ye! Bu haram deyil, lakin mən (Quran oxuyub ibadət etməklə) Rəbbimə yaxınlaşıram deyə yemirəm"» (əl-Buxari, 855; Müslim, 1253).

124. Cabir (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Soğan, sarımsaq və ya kəvər yeyən məscidimizə yaxınlaşmasın. Həqiqətən, insanların əziyyət çəkdiyindən mələklər də əziyyət çəkir"» (Müslim, 1254).

123-cü və 124-cü hədislərdən çıxarılan nəticələr:

– Sarımsaq, soğan və kəvər yeyib məscidə gəlməyin qadağan olunması;

– Həmçinin bir sıra xoşagetməz, pis iyli (papiros və s.) məmulatları istifadə etdikdən sonra məscidə getmək qadağandır;

– Məscidə yaxınlaşmamağın hikməti, mələklərə və namaz qılanlara əziyyətin verilməməsindədir;

– Sarımsaq, soğan və gəvəri münasib vaxtda yemək caizdir.

## On dördüncü fəsil: «Təşəhhüd[1]»

125. Abdullah ibn Məsud (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) mənə Qurandan bir surə öyrətdiyi kimi, təşəhhüdü də öyrətdi. (O dedi): "ət-təhiyyatu lilləhi va-s-salavatu va-t-teyyibatu, əs-sələmu aleykə əyyuhən-n-nəbiyyu va rahmətullahi va bərakətuhu, əs-sələmu aleynə va alə ibədilləhi-s-salihin, əşhədu ən lə iləhə illəllahu va əşhədu ənnə muhammədən abduhu va rasuluhu"» (əl-Buxari, 831; Müslim, 899).

[1] Namazın sonunda oxunan dua.

Duanın tərcüməsi: «Bütün alqışlar, dualar və yaxşı işlər Allah üçün edilir. Ey Peyğəmbər, sənə salam olsun, Allahın mərhəməti və bərəkəti yetişsin. Bizə və Allahın əməlisaleh bəndələrinə salam olsun. Mən şahidlik edirəm ki, Allahdan başqa (ibadətə layiq olan) məbud (ilah) yoxdur və şahidlik edirəm ki, Məhəmməd Onun qulu və elçisidir»

126. Başqa rəvayətdə: «Sizdən biriniz namazda oturduğu zaman bu duanı oxusun: "ət-təhiyyatu lilləhi…". Bunu etsə, göydə və yerdə olan saleh qullara salam vermiş olar. (Bu duanı oxuduqdan) sonra istədiyi duanı oxusun!» (əl-Buxari, 1202; Müslim, 895).

125-ci və 126-cı hədislərdən çıxarılan nəticələr:

– İbn Məsudun (r.a) rəvayət etdiyi bu təşəhhüd rəvayət olunan bütün təşəhhüdlərin ən əfzəl sayılır;

– Təşəhhüdü oturub oxumaq vacibdir;

– Allahı alqışlamaq, Peyğəmbərə (s.ə.s) və onun səhabələrinə (r.a) xeyir-dua diləmək onların haqlarındandır.

127. Əbdürrəhman ibn Əbi Leylə deyir ki, Kəb ibn Ucra (r.a) ilə rastlaşdıq və o mənə: «İstəyirsən sənə hədiyyə verim?» deyib rəvayət etdi ki, bir dəfə Peyğəmbər (s.ə.s) bizim yanımıza gəldi və biz ona dedik: «Ey Allahın elçisi! Sənə salam verməyi artıq öyrəndik. İndi isə sənə necə salavat etməyi bizə öyrət». O dedi: «Deyin: "Allahummə salli alə Muhammədin va alə əli Muhamməd, kəmə salleytə alə İbrahimə va alə əli İbrahim, innəkə həmidun məcid, va barik alə Muhamməden va alə əli Muhamməd, kəmə bəraktə alə İbrahimə va alə əli İbrahim, innəkə həmidun məcid"» (əl-Buxari, 6357; Müslim, 907).

Duanın tərcüməsi: «Allahım, Məhəmmədə və onun ailəsinə də İbrahimə və onun ailəsinə xeyir-dua verdiyin kimi xeyir-dua ver! Sən, həqiqətən, alqışlara və həmdlərə layiqsən. Məhəmmədə və onun ailəsinə də İbrahimə və onun ailəsinə bərəkət verdiyin kimi bərəkət ver! Sən, həqiqətən, alqışlara və həmdlərə layiqsən».

127-ci hədisdən çıxarılan nəticələr:

– Sonuncu təşəhhüddən sonra Peyğəmbərə (s.ə.s) salavat gətirmək barəsində alimlərin rəyi:

a) Şafii və Əhməd ibn Hənbəlin rəyinə görə salavat gətirmək vacibdir. Onlar yuxarıdakı hədisə əsaslanmışlar.

b) Əbu Hənifə və Malikin rəyinə görə salavat gətirmək sünnədir. Onlar Əbu Davudun «Sünən» əsərində olan hədisə əsaslanmışlar. Abdullah ibn

Məsud rəvayət edir ki, «Bir gün Peyğəmbər (s.ə.s) ona təşəhhüdü öyrətdi və dedi: "Bunu desən namazı tamamlamış olarsan"» («Sünən», 3/178, 966-cı hədis).

– Peyğəmbərə (s.ə.s) salavat gətirmək onun haqlarındandır;

– Artıq Peyğəmbər (.ə.s) səhabələrinə ona salam və salavat gətirməyin keyfiyyətini öyrətmişdir;

– Qiyamətə qədər İslam ümmətinin Peyğəmbərə (s.ə.s) salam və salavat gətirməsi onun dərəcəsinin və hörmətinin artması üçün ən əsas səbəblərdən biridir;

– Həqiqətən sələf[1] elmi məsələləri biri-birinə hədiyyə edər və onu ən qiymətli hədiyyə hesab edərdilər. Doğrudan da elm ən gözəl hədiyyədir!

128. Əbu hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) namazda dua edib deyərdi: "Allahummə inni əuzu bikə mən azəbi-l-qabr va min azəbi-n-nar va min fitnəti-l-məhyə va-l-məməti va min fitnəti-l-məsihi-d-dəccal"» (əl-Buxari, 1377).

Duanın tərcüməsi: «Allahım, həqiqətən mən qəbr və cəhənnəm əzabından, həyatın və ölümün fitnəsindən və yalançı məsihin fitnəsinin şərindən Sənə sığınıram!».

Başqa rəvayətdə: «Təşəhhüddə dörd şeydən Allaha sığının: "Allahummə inni əuzu bikə min azəbi cəhənnəm va əuzu bikə min azəbi-l-qabr va əuzu bikə min fitnəti-l-məhyə va-l-məməti va əuzu bikə min şərri fitnəti-l-məsihi-d-dəccal"» (Müslim, 1324).

128-ci hədisdən çıxarılan nəticələr:

– Təşəhhüd və salavatdan sonra bu duanı oxumağın müstəhəb olması;

– Qəbr və cəhənnəm əzabının mövcud olması və ona iman etməyin vacibliyi;

– Həyatın və ölümün fitnəsinin mövcud olması. Qeyd etmək lazımdır ki, ölümün fitnəsi deyildikdə qəbrdə olan sorğu-sual qəsd olunur.

– Dünya şəhvətlərindən və onun şərindən Allaha sığınmaq;

– Məsihi-d-Dəccal Qiyamətin on böyük əlamətlərindən biri sayılır. Hüzeyfə ibn Əsid əl-Ğifari(r.a) rəvayət edir ki, «bir gün Peyğəmbər (s.ə.s) bizdən: «Nəyi xatırlayırsınız?» – deyə soruşdu. Biz: «Qiyaməti xatırlayırıq» – cavabını verdik. O, dedi: «Həqiqətən, on əlamət görməmiş Qiyamət qopmaz». Sonra dumanı, dəccalı, heyvanı (dəbbəni), günəşin

[1] Mənası: keçmiş nəsil deməkdir. Burada Peyğəmbər (s.ə.s), onun əhli-beyti, səhabələr və onların ardınca gedənlər nəzərdə tutulur.

məğribdən çıxmasını, İsanın (ə.s) nazil olmasını[1], Yəcuc və məcucun peyda olmasını, Ayın üç dəfə: məşriqdə, məğribdə və Ərəb yarımadasında tutulmasını və Yəməndən çıxan odun insanları məhşərə tərəf yönəltməsini xatırlatdı» (Müslim, 18/234, 7214-cü hədis).

129. Abdullah ibn Amr ibni-l-As (r.a) Əbu Bəkrdən (r.a) rəvayət edir ki, o, Peyğəmbərə (s.ə.s) dedi: «Namazda dua etməyi mənə öyrət!» Peyğəmbər (s.ə.s) də ona dedi: «De: "Allahummə inni zaləmtu nəfsi zulmən kəsiran va lə yəğfiru-z-zunubə illə əntə, fəğfirli məğfiratən min indikə varhəmni innəkə əntəl-ğafuru-r-rahim"» (əl-Buxari, 834; Müslim, 6809).

Duanın tərcüməsi: «Allahım, mən nəfsimə çox zülm etmişəm, günahları bağışlayan isə yalnız Sənsən, məni bağışla və mənə rəhm et! Həqiqətən, Sən bağışlayan və rəhm edənsən!»

129-cu hədisdən çıxarılan nəticələr:

– Bu duanı namazda oxumağın müstəhəb olması;

– Əbu Bəkr əs-Siddiqin (r.a) elm sahibi olması;

– Peyğəmbərin (s.ə.s) səhabəsinə qarşı diqqətli olması və onun istəyini yerinə yetirməsi;

– Bu duanın səcdədə və ya təşəhhüddən sonra oxunması;

– Peyğəmbərin (s.ə.s) və Əbu Bəkrin (r.a) təvzökar və təqvalı (Allahdan çox qorxan) olması.

130. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) "Allahın köməyi və zəfər gəldikdə; insanların dəstə-dəstə Allahın dininə daxil olduğunu gördüyün zaman; Rəbbini həmd-səna ilə təqdis et və Ondan bağışlanmağını dilə; Həqiqətən, O, tövbələri qəbul edəndir" («ən-Nəsr») surəsi nazil olduqdan sonra hər namazında bu duanı oxuyardı: "Subhənəkə Allahummə Rabbənə va bihəmdikə, Allahummə-ğ-firli"» (əl-Buxari, 794; Müslim, 1087).

Duanın tərcüməsi: «Ey bütün nöqsanlardan uzaq olan Allahım, ey Rəbbim, Sənə həmd olsun! Allahım, məni bağışla!»

Başqa rəvayətdə: «Peyğəmbər (s.ə.s) rüku və səcdədə bu duanı çox edərdi: "Subhənəkə Allahummə Rabbənə va bihəmdikə, Allahummə-ğ - firli» (Müslim, 1085).

---

[1] İsanın Qiyamətdən əvvəl nazil olmasına iki ayə dəlalət edir:

«Şübhəsiz ki, o (İsanın zühuru) Qiyamət saatı üçün bir əlamətdir» (əz-Zuxruf, 61);

«Kitab əhlindən elə bir kəs olmaz ki, ölümündən əvvəl ona (İsaya) iman gətirməsin» (ən-Nisa, 159).

130-cu hədisdən çıxarılan nəticələr:
– Rüku və səcdədə bu duanı etməyin müstəhəb olması;
– İbadətləri, xüsusən də namazları istiğfar etməklə (Allahdan bağışlanma diləməklə) tamamlamaq;
– Allahı nöqsanlardan uzaq saymaq, Ona həmd-səna etmək və Ondan bağışlanma diləmək duanın qəbul olmasına səbəbdir;
– Allahdan bağışlanma diləmək əfzəl əməllərdən sayılır.

## On beşinci fəsil: «Vitr[1] namazı»

131. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) minbərdə ikən bir kişi ondan gecə namazı haqqında soruşduqda o, dedi: "İki rükət, iki rükət qılın. Sübh namazının vaxtının daxil olmasından qorxduğunuz zaman bir rükət (vitr) namaz qılıb cüt-cüt qıldığınız namazların (cəmi) sayını təkləşdirin"; Beləliklə də "Vitri gecə qıldığınız namazların sonuncusu edin!"» (əl-Buxari, 990, 998; Müslim, 174, 175).

131-ci hədisdən çıxarılan nəticələr:
– Gecə qılınan rükətlərin cüt sayda (iki-iki) olması;
– Gecə yuxudan oyanmağa qadir olan şəxs üçün Vitr namazını gecənin axırında qılmaqğın daha əfzəl olması;
– Vitr namazının qılınmasının müstəhəb olması.

132. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) gecənin hər vaxtında – əvvəlində, ortasında və axırında Vitr namazını qılardı. (Əfzəl olduğu üçün) Vitri sübh namazına yaxın (gecənin sonunda) qılardı» (əl-Buxari, 996; Müslim, 1434).

132-ci hədisdən çıxarılan nəticələr:
– Vitr namazını gecənin əvvəlində, ya ortasında, ya da axırında qılmaq caizdir;
– Vitr namazını gecənin axırında qılmaq daha əfzəldir.

133. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) gecə on üç rükət namaz qılardı. Sonuncu beş rükəti ardıcıl (heç bir rükətdə təşəhhüdə oturmadan) qılıb yalnız sonuncu rükətdə (təşəhhüdə) oturardı» (Müslim, 1717).

---
[1] Gecə qılınan təkrükətli namaz.

133-cü hədisdən çıxarılan nəticələr:

– Peyğəmbərin (s.ə.s) gecə namazını (təhəccüd) on üç rükət qılması. (O, namazları cüt-cüt qılar, sonra isə onları Vitr ilə tamamlayardı);

– Peyğəmbərin (s.ə.s) beş rükət ardıcıl namaz qılması;

– Gecə namazının fərz namazlarından sonra ən əfzəl namaz sayılması;

– Əl-Mühamili Peyğəmbərin (s.ə.s) vitr namazının növlərini aşağıdakı kimi qeyd etmişdir:

a) bir rükət;

b) üç rükət (iki, sonra da bir ayrı, və ya üç rükət ardıcıl);

v) beş rükət (ardıcıl);

q) yeddi rükət (altı rükət ardıcıl qılıb təşəhhüdü oxumaq, sonra qalxıb yeddinci rükəti tamamlamaq);

d) doqquz rükət (səkkiz rükət ardıcıl qılıb təşəhhüd oxumaq, sonra qalxıb doqquzuncu rükəti tamamlamaq);

e) on bir rükət (on rükəti cüt-cüt qılıb salam verməklə tamamlamaq, sonra da bir rükət qılmaq).[1]

Qeyd: Burada, ardıcıl dedikdə, rükətlər arasında təşəhhüdü oxumamaq nəzərdə tutulur.

## On altıncı fəsil: «Namazdan sonra oxunan zikrlər»

134. Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbərin (s.ə.s) zamanında fərz namazından sonrakı zikrlər səslə edilərdi. Mən namazın bitməsini, zikrləri eşitməklə təyin edərdim» (əl-Buxari, 831; Müslim, 1318).

Başqa rəvayətdə: «Biz Peyğəmbərin (s.ə.s) təkbiri etməsilə namazı qılıb qurtardığını yəqin edərdik» (Müslim, 1317).

134-cü hədisdən çıxarılan nəticələr:

– Namazdan sonra zikr etməyin müstəhəb olması. Belə ki, bu, Peyğəmbərə (s.ə.s) mütilik əlamətindən sayılır;

– Zikr etdikdə səsi qaldırmağın caiz olması;

– İbn Abbas (r.a) səhabələrin ucadan zikr etdiklərini məscidin kənarından eşitmişdir.

[1] «Teysiru-l-alləm», 1/282.

135. Vərrad[1] rəvayət edir ki, «Ağam əl-Muğira ibn Şöbə (r.a) Müaviyəyə (r.a) göndərdiyi məktubu diktə edib mənə yazdırdı: «Peyğəmbər (s.ə.s) fərz namazlarından sonra zikr edib deyərdi: "Lə iləhə illəllahu vahdəhu lə şərikə ləh, ləhu-l-mulku va ləhu-l-həmdu va huva alə kulli şeyin qadir. Allahummə lə mənia limə ətaytə va lə mu'tiyə limə mənatə va lə yənfəu zə-l-cəddu minkə-l-cəd". Sonra mən, Müaviyənin (r.a) bu zikri etməyi camaata əmr etdiyini eşitdim» (əl-Buxari, 844; Müslim, 1337).

Duanın tərcüməsi: «Allahdan başqa ibadətə layiq olan məbud yoxdur, təkdir, heç bir şəriki yoxdur. Mülk, həmd yalnız Onun üçündür və O hər şeyə qadirdir. Allahım, Sənin (nemət) əta etdiyinə mane olan, mane olduğuna da(nemət) əta edən tapılmaz və hər hansı var-dövlət sahibinin var-dövləti Sənin yanında ona heç bir fayda verməz».

Başqa rəvayətdə: «Peyğəmbər (s.ə.s) dedi-qodunu, israf etməyi, çox sual verməyi, ananın üzünə ağ olmağı, qız uşaqlarını diri-diri basdırmağı, (var-dövləti) xərcləməyib yığmağı qadağan etdi» (əl-Buxari, 6473).

135-ci hədisdən çıxarılan nəticələr:

– Namazdan sonra bu duanı oxumağın müstəhəb sayılması;

– Bu duanın tövhidlə bağlı olması;

– Hədisdə qeyd olunanların Peyğəmbərin (s.ə.s) qadağan etdiyi əməllərdən olması;

– Yalnız Allaha təvəkkül etmək. Çünki neməti əta etmək, ondan məhrum etmək ancaq Allaha məxsusdur;

– Səhabələrin dərhal sünnətə riayət etməsi;

– Bir nəfər tərəfindin varid olan xəbərin qəbul olunması.

136. Summi Əbu Salehdən, o da Əbu Hüreyrədən (r.a) rəvayət edir ki, «Mühacirlərdən[2] olan kasıblar Peyğəmbərin (s.ə.s) yanına gəlib dedilər: "Ey Allahın elçisi! Dövlətlilər cənnətə və əbədi nemətə nail oldular". Peyğəmbər (s.ə.s) bunun səbəbini soruşduqda, onlar dedilər: "Onlar bizim kimi namaz qılır, oruc tuturlar. Bundan əlavə onlar sədəqə verir, qul azad edirlər, biz isə bunu bacarmırıq". Peyğəmbər (s.ə.s) onlara dedi: "İstəyirsiniz sizə elə bir şey öyrədim ki, onu etdikdə ən fəzilətli insanlardan olasınız və yalnız onu edənin fəziləti sizin fəzilətiniz kimi olsun?" Onlar: "Öyrət, ey Allahın elçisi!" – dedikdə, o dedi: "Hər (fərz olan) namazdan

---

[1] Əbu Səid əs-Səqafi.

[2] Məkkənin fəthindən, yə'ni hicrətin 8-ci ilindən əvvəl Məkkədən Mədinəyə hicrət edənlər.

sonra 33 dəfə təsbih[1], təkbir[2] və təhmid[3] edin"» (əl-Buxari, 843; Müslim, 1346).

Əbu Saleh rəvayət edir ki, «Onlar yenidən Peyğəmbərin (s.ə.s) yanına gəlib: "Ey Allahın elçisi! Dövlətli qardaşlarımız etdiyimiz zikrləri eşidib bizim kimi zikr edirlər" – dedikdə, o dedi: "Bu Allahın istədiyinə verdiyi lütfüdür"»

Summi rəvayət edir ki, «Mən bu hədisi yaxınlarıma danışdım. Onlar mənə: "Sən səhv edirsən, əksinə 33 dəfə təsbih, 33 dəfə təhmid və 33 dəfə təkbir etməlisən" – dedikdə, mən Əbu Salehin yanına gedib bunu ona xəbər verdim. O mənim əlimdən tutub dedi: "Allahu əkbər, subhənallah, əlhəmdu-lilləh – bunların cəmi 33-ə çatana qədər zikr et!"» (Müslim, 1346).

136-cı hədisdən çıxarılan nəticələr:

– Savab qazanmaq üçün səhabələrdə olan şiddətli rəğbət. Belə ki, onlar fəzilətli əməllərdə biri-birinə qibtə edərdilər;

– Müsəlmanın Allah yolunda var-dövlətindən xərcləməsi onun Cənnətdə dərəcəsinin yüksəlməsinə səbəbdir;

– Hədisdə qeyd olunan zikrlər fəzilətli zikrlərdəndir;

– Həqiqətən, hidayət (düz yola yönəltmək) və ruzi Allahın əlindədir və o yalnız istədiyi şəxsə ondan əta edir;

– Zikrlər hədisdə varid olduğu qaydada yerinə yetirilməlidir.

137. Aişə (r.a) rəvayət edir ki, «Bir dəfə Peyğəmbər (s.ə.s) üzərində müxtəlif rənglərdən ibarət xətlər olan paltarda namaz qıldı və o xətlərə nəzər saldı. Namazı qılıb qurtardıqdan sonra dedi: "Aparın bu paltarı verin Əbu Cəhmə[4], mənə də sadə (üzərində fikri yayındıra biləcək əlamət olmayan) bir ənbicaniyyə[5] gətirin. Həqiqətən, bu, məni namazdan yayındırdı"» (əl-Buxari, 373; Müslim, 1238).

137-ci hədisdən çıxarılan nəticələr:

– Namazı qorxu ilə qılmaq və ondan yayındıra biləcək hər bir amildən uzaq olmaq;

– Hədiyyəni qəbul etmək;

[1] «Subhənallah» demək.
[2] «Allahu əkbər» demək.
[3] «Əlhəmdu lilləh» demək.
[4] Adı: Übeydullah ibn Huzeyfə əl-Quraşi əl-Adəvi (r.a).
[5] Yundan hazırlanmış paltar.

– Müəyyən səbəbə görə hədiyyəni qəbul etməmək, bir şərtlə ki, hədiyyə verən inciməsin deyə, bunun səbəbini bəyan etmək lazımdır;
– Peyğəmbərin (s.ə.s) əxlaqının gözəlliyi hədiyyə verən şəxslə olan münasibətdən açıq-aydın görünür;
– Üzərində xətlər olan libası geyinməyin caiz olması;
– Namazdan yayındıran amillərlə məscidləri bəzəməmək.

### On yeddinci fəsil: «Səfərdə iki namazı cəm etmək»

138. Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) səfərdə olduğu müddətdə Zöhrlə Əsr namazını, Məğriblə də İşa namazını cəm edərdi» (əl-Buxari, 1107).

138-ci hədisdən çıxarılan nəticələr:
– Səfərdə, xəstələndikdə, cihadda və s. hədislərdə varid olan bu kimi səbəblərə görə Zöhrlə Əsri, Məğriblə də İşa namazlarını cəm edib qılmaq caizdir;
– Bu namazları cəm şəklində tezləşdirməklə[1], və ya təxirə salmaqla[2] qılmaq caizdir;
– Cəm etmək yalnız bu namazlara məxsusdur. Fəcr namazı isə heç bir namazla cəm edilmir.

### On səkkizinci fəsil: «Səfərdə namazı qısaltmaq»

139. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərə (s.ə.s), Əbu Bəkrə (r.a), Ömərə (r.a) və Osmana (r.a) yol yoldaşı oldum. Onlar səfərdə olduqları müddətdə namazları iki rükətdən artıq qılmazdılar» (əl-Buxari, 1102; Müslim, 1577).

139-cu hədisdən çıxarılan nəticələr:
– Səfərdə dördrükətli namazları qısaldıb iki rükət qılmaq;
– Səfərdə namazı qısaltmaq Peyğəmbərin (s.ə.s) və raşidi xəlifələrin sünnəsindəndir;
– Bu rüxsət Allahın insanlara olan lütfündəndir;

---

[1] Tezləşdirmək: zöhrlə əsri zöhrün əvvəl vaxtında, məğriblə işanı da məğribin əvvəl vaxtında cəm edib qılmaq.
[2] Təxirə salmaq: zöhrlə əsri əsrin axır vaxtında, məğriblə işanı da işanın axır vaxtında cəm edib qılmaq.

– Bu hədisdə səfərin məsafəsi qeyd olunmamışdır. Buna görə də səfər üçün məsafə yerli adətə görə ölçülür.

**On doqquzuncu fəsil: «Cümə»**

140. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Cümə namazına gələn qüsl etməlidir"» (əl-Buxari, 894; Müslim, 1948).

140-cı hədisdən çıxarılan nəticələr:
– Cümə qüslünün vacib olması. Qeyd etmək lazımdır ki, qüslsüz qılınan Cümə namazı məqbuldur;
– Bu qüsl cümə namazından əvvəl edilməlidir. Hədisdə cümə günü yox, Cümə namazı nəzərdə tutulur;
– Cümə namazına getməzdən əvvəl qüsl etmək daha əfzəldir;
– Qüsl etməyin hikməti ondadır ki, insan ibadət etdiyi yerə təmiz və gözəl qiyafədə getsin. Uca Allah «əl-Əraf» surəsinin 31-ci ayəsində buyurur:

يَابَنِي آدَمَ خُذُوا زِينَتَكُمْ عِنْدَ كُلِّ مَسْجِدٍ

«Ey Adəm oğulları! Hər ibadət vaxtı məscidə gedərkən gözəl libaslarınızı geyin»;
– Qüsl yalnız cümə namazını qılan şəxsə vacibdir. Bu namazı tərk edib Zöhrü qılarsa qüsl etmək ona lazım gəlməz.

141. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) (cümə günü) iki xütbə verər və onların arasında oturardı» (əl-Buxari, 920; Müslim, 1992).

141-ci hədisdən çıxarılan nəticələr:
– Cümə namazından əvvəl iki xütbə verilməlidir ki, bu da namazın səhih (mötəbər) olması üçün şərtdir. əl-Hələbi demişdir: «Peyğəmbərdən (s.ə.s) xütbəsiz Cümə namazı qıldığı rəvayət olunmamışdır. Bunu etmək caiz olsa idi bir dəfə də olsa belə Peyğəmbər (s.ə.s) Cümə namazını xütbəsiz qılar və beləliklə də bunun caiz olduğunu ümmətinə bəyan edərdi».
Qeyd: ümumiyyətlə hər hansı bir müvəqqəti rüxsət verilmiş ibadəti Peyğəmbər (s.ə.s) heç zaman etməmişdir.
– İmamın ayaq üstə xütbə verməsi müstəhəbdir;
– Həmçinin iki xütbə arasında oturması da müstəhəbdir.

142. Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) cümə xütbəsini verdiyi zaman bir kişi gəlib oturdu. Peyğəmbər (s.ə.s) ondan: "Namaz qıldınmı?" – deyə soruşduqda, o: "Yox" – dedi. Peyğəmbər (s.ə.s) də ona əmr edib dedi: "Dur, iki rükət namaz qıl!"» (əl-Buxari, 930; Müslim, 2017).

142-ci hədisdən çıxarılan nəticələr:
– Cümə namazından əvvəl olan iki xütbənin verilməsi vacibdir;
– Məscidə daxil olduqda qılınan iki rükət namaz müstəhəbdir;
– Bu iki rükəti qılmamış oturan şəxs dərhal qalxıb onu qıla bilər;
– İmamın xütbə zamanı zərurət olduqda xütbədənkənar danışması caizdir;
– Cümə namazı yalnız iki rükət qılınır.
– Peyğəmbər (s.ə.s) hansı vəziyyətdə olduğundan asılı olmayaraq gördüyü xətanı dərhal düzəltməsi;

143. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Cümə günü imam xütbə verdiyi zaman yanında oturana "Danışma!" deyən (cümənin) savabını qazanmaz"» (əl-Buxari, 934; Müslim, 1962).

143-cü hədisdən çıxarılan nəticələr:
– Xütbə zamanı imamı dinləmək və susmaq vacibdir;
– Xütbəni dinləyib susmaq yalnız onu eşidənlər üçün vacibdir.

144. Əbu Hazim ibn Dinar rəvayət edir ki, «Bir dəstə kişi mübahisələrini həll etmək üçün gəlib Səhl ibn Səd əs-Saididən (r.a) Peyğəmbərin (s.ə.s) minbərinin hansı ağacdan düzəldilməsi barəsində soruşdular. O, minbərin meşə yulğunundan[1] olduğunu və Peyğəmbərin (s.ə.s) onun (minbərin) üzərində necə namaz qıldığını xəbər verib dedi: "Peyğəmbər (s.ə.s) minbərin üzərində təkbir edib (*namaza başladı*) sonra rüku etdi, (*rükudan qalxdı*)[2]. Sonra dalı-dalı gedərək minbərdən düşdü və (minbərin yanında) səcdə etdi. O, bu qaydada namazını başa çatdırdıqdan sonra üzünü səhabələrə tutub dedi: "Ey insanlar! Namazın qılınmasında mənə təqlid edəsiniz və necə qılınmasını məndən öyrənəsiniz deyə belə etdim"» (əl-Buxari, 917; Müslim, 1216).

---

[1] Meşədə bitən ağac.
[2] Mötərizələrin içindəki əlavə bu hədisin başqa rəvayətindən götürülüb.

144-cü hədisdən çıxarılan nəticələr:
– Tabiinlərin elmi bəhs etməsi və alimlərdən bəhrələnməsi;
– İmamın təlim üçün hündür yerdə dayanıb namaz qılmasının caiz olması;
– Ehtiyac ucundan namazda hərəkət etməyin caiz olması;
– İbadətdə Peyğəmbəri (s.ə.s) təqib etməyin vacib olması;
– Peyğəmbərin (s.ə.s) gözəl şəkildə təlim keçməsi.

145. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Cənabət qüslü (kimi qüsl) edib, cümə gününün *ilk saatında*[1] məscidə gedən şəxs bir dəvə, ikinci saatında gedən bir öküz, üçüncü saatında gedən bir qoç, dördüncü saatında gedən bir xoruz, beşinci saatında gedən isə bir yumurta qurban etmiş[2] kimidir. İmam minbərə çıxdıqda isə artıq mələklər onun xütbəsini dinləyər"» (əl-Buxari, 881; Müslim, 1961).

145-ci hədisdən çıxarılan nəticələr:
– Cümə qüslünün fəzilətli olması;
– Cümə gününün ilk saatında məscidə getməyin əfzəl olması;
– Cümə qüslünün savabının yalnız cümə namazına gələn üçün yazılması;
– Fəzilət baxımından dəvənin öküzdən, öküzdə qoçdan daha əfzəl olması;
– Sədəqənin, az da olsa belə, məqbul olması;
– Mələklərin məscidin qapılarında dayanıb daxil olanları kitablarına qeyd etməsi;
– İmam daxil olduqdan sonra isə mələklərin xütbəni dinləmək üçün dayandıqları yeri tərk etməsi;
– Gün doğan andan imamın məscidə daxil olduğu ana qədər olan müddəti beş yerə bölməklə hədisdə qeyd olunan saatları təyin etmək mümkündür;
– Yalnız üç sinif heyvandan qurban vermək caizdir: dəvə, öküz və qoç (keçi də bura daxildir).

146. Sələmətu ibn əl-Əkva (r.a) – ağacın altında beyət[3] etmiş səhabələrdəndir – rəvayət edir ki, «Biz Peyğəmbər (s.ə.s) ilə bərabər Cümə

---

[1] Bu əlavəni müəllif imam Malikin «Muvatta» əsərindən götürüb.
[2] Sədəqə vermiş.
[3] Peyğəmbərə (s.ə.s) sədaqət andı içmək. Bu beyət Hudeybiyyə sülhü ərəfəsində olub və orada 1400 və ya bir az çox səhabə iştirak edib.

namazını, divarların kölgələnə biləcəyimiz kölgəsi olmadığı bir zamanda qılıb qurtarardıq» (əl-Buxari, 4168; Müslim, 1990).

Başqa rəvayətdə: «Biz Peyğəmbər (s.ə.s) ilə bərabər, günəş zeniti keçdikdən sonra Cümə namazını qılar, sonra da kölgələnmək üçün yer axtarardıq» (Müslim, 1989).

146-cı hədisdən çıxarılan nəticələr:

– Cümə namazını əvvəl vaxtında qılmaq. Alimlər cümə namazının əvvəl vaxtı barəsində ixtilaf etmişlər. Lakin qeyd etmək lazımdır ki, günəş zeniti keçdikdən sonra (zöhr namazının başladığı vaxt) qılmaq əfzəl[1], əvvəl isə (bayram namazlarının başladığı zaman) bunu etmək caizdir[2].

– Cümə namazını zöhrün axır vaxtına qədər qılmaq caizdir.

147. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Cümə günü Fəcr namazında "Səcdə" və "İnsan" surələrini oxuyardı» (əl-Buxari, 891; Müslim, 2031).

147-ci hədisdən çıxarılan nəticələr:

– Cümə günü, fəcr namazında bu iki surəni oxumağın müstəhəb olması (bəyənilməsi);

– Peyğəmbərin (s.ə.s) çox vaxt Fəcr namazında bu surələri oxuması.

## İyirminci fəsil: «İki bayram[3]»

148. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s), Əbu Bəkr (r.a) və Ömər (r.a) bayram namazlarını xütbədən əvvəl qılardılar» (əl-Buxari, 963; Müslim, 2041).

149. əl-Bəra ibn Azib (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Qurban bayramında namazdan sonra verdiyi xütbədə dedi: "Bizim kimi namaz qılıb qurban kəsənin qurbanı qəbul olunur. Namazdan əvvəl bunu edənin kəsdiyi (heyvan) qurban kimi qəbul olunmur"». Əl-Bəra ibn Azibin (r.a) dayısı Əbu Burdətə ibn Niyar (r.a) deyir ki, «Mən Peyğəmbərə (s.ə.s): "Ey Allahın elçisi! Mən bu günün yemək-içmək (bayram) günü olduğunu bilib bir qoyun kəsdim. Bu qoyun evimdə kəsilən ilk heyvan olsun deyə onu

---

[1] Çünki Peyğəmbər (s.ə.s) daima belə edərdi.
[2] Çünki Peyğəmbər (s.ə.s) hərdən belə edərdi.
[3] Fitrə (şəvval ayının 1-i) və Qurban (zi-l-hiccə ayının 10-u) bayramları.

namazdan əvvəl kəsdim və nahar etdim" – dedikdə, o dedi: "Kəsdiyin qoyun yalnız yemək üçündür (qurban kimi qəbul olunmur)". Mən Peyğəmbərdən (s.ə.s) "Ey Allahın elçisi! Mənim evimdə iki qoyundan da sevimli olan bir çəpişim var. Onu kəssəm qurbanı əvəz edərmi?" – deyə soruşduqda, o dedi: "Bəli, lakin səndən sonra belə edənin (bayramdan əvvəl kəsdiyi heyvanının) əvəzini verməz"» (əl-Buxari, 955; Müslim, 5042, 5043).

148-ci və 149-cu hədislərdən çıxarılan nəticələr:

Peyğəmbər (s.ə.s) ilk bayram namazını – fitrə bayramı – hicrətin ikinci ilində qılmışdır.

– Xütbəni bayram namazından sonra vermək Peyğəmbərin (s.ə.s) sünnəsindəndir[1];

– Namaz qılıb xütbəni dinləyib sonra qurbanını kəsən şəxs sünnətə riayət etmiş sayılır;

– Qurbanın kəsilmə vaxtı bayram namazının tamamlanması ilə başlayır. Vaxtından tez qurbanını kəsən, cahil də olsa belə, kəsdiyi heyvan qurban kimi yox, sədəqə kimi qəbul olunur;

– Həmin gün sevinc, fərəh və yeyib-içmək günüdür. Elə isə o günü bayram niyyətilə keçirmək ibadətdən sayılır;

– Bir yaşından az kəsilən qurbanlıq keçi qurban kimi məqbul deyildir;

– Çəpişin qurbanlıq kimi qəbul olunması yalnız Əbu Burdətəyə (r.a) məxsusdur.

150. Cundub ibn Abdullah əl-Bəcəli (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Qurban günü (bayram) namazı qıldı, sonra xütbə verdi, daha sonra qurbanlıq heyvanı kəsdi və dedi: «Namazdan əvvəl qurban verən, (bayram namazından sonra) onun əvəzinə başqa bir heyvan kəssin! Qurban verməyən isə, Allahın adını çəkib ("bismilləh" deyib) heyvanı kəssin!"» (əl-Buxari, 985; Müslim, 5037).

150-ci hədisdən çıxarılan nəticələr:

– Qurban kəsmək təkid olunmuş sünnədir. Belə ki, imkanı olmayana qurban kəsmək vacib deyildir.

151. Cabir (r.a) rəvayət edir ki, «Mən, Peyğəmbərin (s.ə.s) qıldığı bayram namazının şahidi oldum. O, xütbədən əvvəl azan və iqamə vermədən bayram namazını qıldı və (xütbə zamanı) səhabələrə Allahdan

---

[1] Yəni daima etdiyi əməllərdəndir.

qorxmağı, Ona itaət etməyi əmr etdi. Sonra onlara öyüd-nəsihət etdi və (Allahın axirət gününə hazırladığı nemət və əzabını) xatırlatdı. Daha sonra Bilalın (r.a) əlindən tutub qadınların yanına getdi. Onlara da öyüd-nəsihət edib xatırlatdıqdan sonra dedi: "Həqiqətən, Cəhənnəm əhlinin (sakinlərinin) əksəriyyəti siz[1] olacaqsınız". Onların arasından bir qarayanız qadın ayağa qalxıb: "Nə üçün, ey Allahın elçisi?" – deyə soruşduqda, o dedi: "Çünki, siz (qadınlar) çox gileylənir və ərlərinizin sizə etdiyi yaxşılıqlara qarşı nankorluq edirsiniz". Qadınlar da bər-bəzəklərini, sırğa və üzüklərini Bilalın (r.a) ətəyinə atıb Allah yolunda sədəqə verdilər» (əl-Buxari, 978; Müslim, 2041).

151-ci hədisdən çıxarılan nəticələr:

– Bayram namazının xütbədən əvvəl qılınması;

– Bayram namazının azan və iqaməsiz qılınması;

– İmamın ayaq üstə xütbə verməsi (müstəhəbdir);

– İmamın xitab olunanlara təqvanı (Allahdan qorxmağı) əmr etməsi və münasib mövzuda danışması;

– Təqvanı artırmaq üçün Cəhənnəmi xatırlatmaq;

– Qadınlara ayrıca vəzə vermək iki səbəbə görə olar: a) xütbəni eşitmədikləri təqdirdə; b) yalnız qadınlara aid olanı onlara xatırlatdıqda;

– Qadınların bayram namazında iştirak etməsi;

– Qadınların xütbə zamanı (və s. yerlərdə) kişilərə qarışmaması;

– Allahın bəxş etdiyi nemətə naşükürlüyün Cəhənnəmə aparan amillərdən olması;

– Sədəqə verməyin əzabdan qurtarmaq üçün bir səbəb olması;

– Əzabın səbəbini soruşmaq səhabə qadının düşüncəli olmasına dəlalət edir;

– Ağıllı, düşüncəli qadın ona məxsus olan maldan, ərinin izni olmasa belə, sədəqə verə bilər;

– Əzabdan qurtarmaq üçün xeyirxah işlər görməyə tələsmək;

– Cəhənnəm əhlinin əksəriyyətinin qadın olması. Bunun da səbəbi hədisdə açıq-aydın qeyd olunmuşdur.

152. Ummu Atiyyə[2] (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) bakirə qızların, heyzli qadınların bayram namazlarına gəlməsini bizə əmr edər və heyzli qadınları namaz qılınan yerdən uzaqlaşdırardı» (əl-Buxari, 351; Müslim, 2051).

[1] Yəni, qadınlar.
[2] Adı: Nuseybətu bint Kəb əl-Ənsariyyə.

Başqa rəvayətdə: «Bakirə qızları və heyzli qadınları bayram namazına çıxartmaq bizə əmr olunardı. Heyzli qadınlar o günün xeyir-bərəkətinə nail olmaq üçün camaatın arxasında (namaz qılınan yerdən aralı) oturar, təkbir və dua edərdilər» (əl-Buxari, 971).

152-ci hədisdən çıxarılan nəticələr:
– Bayram namazının hökmü:
a) Hənbəli məzhəbinin rəyinə görə bu namazları qılmaq fərdu-l-kifayədir;
b) Maliki və Şafii məzhəblərinin rəyinə görə bu namazları qılmaq sünnətdir;
v) Hənəfi məzhəbinin rəyinə görə bu namazları qılmaq vacibdir.
Qeyd etmək lazımdır ki, Peyğəmbərin (s.ə.s) hətta qadınlara bu namazı müşahidə etməyi əmr etməsi bu namazın çox əhəmiyyətli olmasına işarədir.
– Heyzli qadının məscidə (ibadət olunan yerə) daxil olmaması;
– Bayram namazı qılındığı yerin məscid hökmündə olması;
– Heyzli qadının dua və zikr etməsi;
– Bayram gününün fəziləti böyükdür. Belə ki, o gün Uca Allah duaları qəbul edir;
– Bayram günü deyilən təkbirin qaydası:
«Allahu əkbər, Allahu əkbər, lə iləhə illəllah, Allahu əkbər, Allahu əkbər və ilahi-l-həmd». Bu duanı hər kəs camaatla (xorla) deməmək şərtilə təkrarlamalıdır.

## İyirmi birinci fəsil: «Kusuf[1] namazı»

153. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbərin (s.ə.s) zamanında günəşin üzü tutuldu və o, camaatı namaza çağırmaq üçün bir nəfər göndərdi. Onlar namaz qılmaq üçün toplandıqdan sonra Peyğəmbər (s.ə.s) təkbir edib dörd ruku və dörd səcdədən ibarət iki rükət namaz qıldı» (Müslim, 2089).

153-cü hədisdən çıxarılan nəticələr:
– Günəş tutulduqda qılınan namazın müstəhəb olması;
– Kusuf namazında Allaha dua etmək, Ondan bağışlanma diləmək (müstəhəbdir);
– Kusuf namazı üçün azanın vermək(müstəhəbdir);
– Bu namazın iki rükət, dörd rüku və dörd səcdədən ibarət olması;

[1] Günəşin tutulması prosesi.

– Peyğəmbərin (s.ə.s) zamanında günəşin tutulması.

154. Əbu Məsud – Uqbətu ibn Amr – əl-Ənsari əl-Bədri (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Həqiqətən, günəş və ay Allahın yaratdığı rəmzlərdir ki, Allah bununla (günəş və ay tutulması ilə) qullarını qorxudur. Günəş və ayın üzü heç kəsin ölümünə və ya doğulduğuna görə tutulmur. Onların tutulduğunu gördüyünüz zaman namaz qılın və bu hal sona çatana qədər Allaha dua edin!"» (əl-Buxari, 1041; Müslim, 2111).

154-cü hədisdən çıxarılan nəticələr:

– Günəş və ya ay tutulduqda Allaha dua etmək və ümidlə Ondan bağışlanma diləmək;

– Günəş və ya ayın üzü açılana qədər namaz qılıb dua etmək;

– Günəş və ya ayın tutulması zamanı (namaz qılınması) qadağan olunmuş vaxta təsadüf etsə belə, kusuf və ya xusuf[1] namazını qılmaq caizdir. Çünki bunlar səbəbli namazlardandır;

– Günəş və ya ayın tutulmasının hikməti ondadır ki, insanlar günah etdiklərini dərk etsinlər və ondan çəkinsinlər. Həmçinin yatmış qəlblər oyansın və Qiyamət gününü xatırlasın.

155. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbərin (s.ə.s) zamanında günəş tutuldu və o, camaata namaz qıldırdı. Namaz əsnasında qiyam[2] və rukunu uzatdı, sonra rukudan qalxdı və əvvəlkinə nisbətən az qiyamda durdu, sonra ruku etdi və əvvəlkinə nisbətən az rukuda qaldı, (rukudan qalxdıqdan) sonra səcdə etdi və onu da uzatdı. İkinci rükəti də bu qaydada qılıb, artıq günəşin üzü açıldığı zaman namazını bitirdi. Sonra Allaha həmd-səna edib dedi: "Həqiqətən, günəş və ay Allahın yaratdığı rəmzlərdir. Onlar heç kəsin ölümünə və ya doğulduğuna görə tutulmur. Onların tutulduğunu gördüyünüz zaman Allaha dua edin, təkbir gətirin, namaz qılın və sədəqə verin. Ey Məhəmməd ümməti! Allaha and olsun ki, heç biriniz Allahın zina etdiyi quluna (kişi və ya qadın) qarşı qeyrətli[3] olduğu kimi (qeyrətli) ola bilməz. Ey Məhəmməd ümməti! Mənim bildiyimi bilsəniz, az gülüb çox ağlayardınız"» (əl-Buxari, 1044; Müslim, 2086).

156. Əbu Musa əl-Əşari (r.a) rəvayət edir ki, «Peyğəmbərin (s.ə.s) zamanında günəş tutuldu. O, qiyamətin qopduğunu zənn edib məscidə gəldi

---

[1] Xusuf – Ay tutulduqda qılınan namaz.
[2] Təkbirdən rükuya qədər ayaq üstə dua və surələrin oxunduğu hal.
[3] Allaha layiqdir, necəliyi bizə məlum deyil.

və namaz qıldı. Namaz əsnasında qiyamı, rukunu və səcdəni uzatdı. Mən onun bu cür namaz qıldığını görməmişdim. Namaz qıldıqdan sonra dedi: "Allahın göndərdiyi bu rəmzlər, kiminsə ölümünə və doğulmasına görə deyildir, lakin Allah bununla qullarını qorxudur. Belə olduğunu gördüyünüz zaman Allaha zikr və dua etməyə, ondan bağışlanma diləməyə tələsin!"» (əl-Buxari, 1059; Muslim, 2114).

155-ci və 156-cı hədislərdən çıxarılan nəticələr:

– Kusuf və ya Xusuf namazından sonrakı xütbənin hökmü:

a) Şafii məzhəbinə görə bu namazlardan sonra xütbə vermək müstəhəbdir;

b) Hənəfi, Maliki və Hənbəli məzhəblərinin rəyinə görə xütbə vermək bəyənilmir. Bu daha mötəbər rəy sayılır. Lakin qeyd etmək lazımdır ki, ehtiyac ucundan qısa moizə vermək caizdir. Çünki Peyğəmbər (s.ə.s) insanların: «Günəş İbrahimin[1] ölümünə görə tutulmuşdur» – dediyini eşitdikdə demişdir: «Həqiqətən, günəş və ay Allahın yaratdığı rəmzlərdir. Onlar heç kəsin ölümünə və ya doğulduğuna görə tutulmur…»

– İcmanın rəyinə görə bu namazlar təkid olunmuş sünnələrdəndir;

– Bu namazlar hədisdə vəsf olunan qaydada qılınmalıdır;

– Bu namazlarda qiyam, rüku və səcdəni uzatmaq bəyənilən haldır;

– Əvvəlki rükət sonrakı rükətdən daha uzun olmalıdır;

– Bu namazlar günəş və ya ayın tutulduğu vaxtdan başlayıb açıldığı vaxta qədər qılınır;

– Ehtiyac olduqda namazdan sonra xütbə vermək caizdir;

– Xütbəni Allahı həmdü-səna etməklə başlamaq lazımdır;

– Günəş və ay Allahın kainatda yaratdığı rəmzlərdir ki, bu da Onun qüdrətli və hikmətli olmağını təsdiq edir;

– Günəş və ayın tutulmasında hikmət ondadır ki, insanlar qorxsun və günah etdiklərini dərk etsinlər;

– Bu vaxt dua etmək, namaz qılmaq və sədəqə vermək bizə əmr olunmuşdur;

– Bu ibadətləri etməklə əzabdan sovuşmaq mümkündür;

– Peyğəmbər (s.ə.s) zinakarlığın (fahişəliyin) böyük günahlardan olmasını ümmətinə bəyan etmiş və onları ondan çəkindirmişdir;

– Allah Ona layiq sifətdə qeyrətlidir; Ümumiyyətlə Allahın ad və sifətləri barəsində söhbət açıldıqda aşağıdakılardan çəkinmək vacibdir:

* Təhrif: Sözü ləfzini və ya mənasını dəyişdirmək. Məsələn: İstiva (ucalmaq) sözünü istəvlə (hökm altına almaq) sözü ilə dəyişdirmək.

---

[1] Peyğəmbərin (s.ə.s) oğlunun adıdır.

* Tatil: Sözü tamamilə inkar etmək. Məsələn: Allahın əli yoxdur demək.

* Təkyif: Sözün keyfiyyətini (necə-nəcürlüyünü) izah etmək. Məsələn: Allahın Öz əllərilə Adəmi (a.s) necə yaratdığını izah etmək.

* Təmsil və Təşbih: Bənzətmə və oxşatma. Məsələn: Allahın əli mənim əlim kimidir və ya ona oxşayır demək.

Hər bir müsəlman Quran və mötəbər hədislərdə sabit olmuş Allahın ad və sifətlərini təsdiq etməli, inkar olunanları (Ona layiq olmayan ad və sifətləri) inkar etməli, məlum olmayanlar barəsində isə susmalıdır.

– Günahkarlar üçün şiddətli əzabın hazırlanması. Belə ki, bu əzabdan insanların xəbəri olsa az gülüb çox ağlayarlar.

– Allahın Peyğəmbərə (s.ə.s) qeybdən xəbər verməsi.

## İyirmi ikinci fəsil: «İstisqa[1] namazı»

157. Abdullah ibn Zeyd ibn Asim əl-Mazini (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) yağışın nazil olmasını Allahdan istəmək üçün əbasını tərsinə çevirib (geyindi) Qibləyə tərəf döndü və dua etdi. Sonra iki rükət səslə namaz qıldı» (əl-Buxari, 1024; Müslim, 2086).

157-ci hədisdən çıxarılan nəticələr:

– İstisqa namazını qılmaq (müstəhəbdir);

– Xütbəni İstisqa namazından əvvəl vermək;

– Dua etdikdə qibləyə tərəf yönəlmək;

– Dua etdikdə libası tərsinə çevirib geyinmək;

– İstisqa namazını səslə qılmaq.

Qeyd: cümə, bayram, xüsuf və kusuf namazları da səslə qılınır.

– Bu namazı geniş yerdə qılmaq.

158. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Cümə günü bir kişi, məscidə Ömərin (r.a) evinin istiqamətində olan qapıdan daxil oldu və ayaq üstə xütbə verən Peyğəmbərə (s.ə.s) yaxınlaşıb dedi: "Ey Allahın elçisi! Mal-qara həlak olur, səfərlər də dayandırılıb (quraqlıq olduğu üçün dəvələrlə səfərə çıxmaq olmur). Allahın bizə yağış nazil etməsi üçün dua et!" Peyğəmbər (s.ə.s) əllərini qaldırıb üç dəfə "Allahım, bizə yağış endir!" – deyə dua etdi».

Ənəs (r.a) deyir ki, «Allaha and olsun ki, göydə nəinki bulud, heç bulud parçası da yox idi. Bizimlə Səlin[1] arasında da nə bir ev, nə də bir koma var

---

[1] Yağışın nazil olmasını istəmək üçün qılınan namaz.

idi. Birdən Səlin arxasından qalxanabənzər bir bulud göründü. Bulud gəlib səmanın ortasına çatdıqda yayıldı və yağış yağdı. Allaha and olsun ki, bir həftə gün üzü görmədik. Cümə günü bir kişi yenə məscidə Ömərin (r.a) evinin istiqamətində olan qapıdan daxil oldu və ayaq üstə xütbə verən Peyğəmbərə (s.ə.s) yaxınlaşıb dedi: "Ey Allahın elçisi! Mal-qara həlak olur, səfərlər də dayandırılıb (yolları su basdığı üçün dəvələrlə səfərə çıxmaq olmur). Allaha, yağışı dayandırması üçün dua et!" Peyğəmbər (s.ə.s) əllərini qaldırıb dua etdi və dedi: "Allahummə həvaleynə va lə əleynə, Allahummə alə-l-əkəm va-z-zirab va butuni-l-əudiyə va mənabiti-l-əşcar". Bu duadan sonra buludlar çəkildi və biz qızmar günəşin altında gəzişməyə başladıq».

Şureyk deyir ki, «Mən Ənəsdən (r.a): "O (ikinci dəfə gələn kişi) həmən kişi (birinci dəfə gələn) idi?" – deyə soruşduqda, o: "Bilmirəm" – deyə cavab verdi» (əl-Buxari, 1013; Müslim, 2075).

Duanın tərcüməsi: «Allahım, bu yağışı bizim ziyanımız üçün yox, xeyrimiz üçün endir. Allahım, bu yağışı yaylaların, təpələrin, vadilərin üzərinə və ağacların dibinə endir!»

158-ci hədisdən çıxarılan nəticələr:

– Xütbəni ayaq üstə vermək;

– Yağışın yağması üçün dua etmək;

– Dua etdikdə əlləri qaldırmaq;

– Yağışın dərhal yağması Məhəmmədin (s.ə.s) peyğəmbərliyini təsdiq edən möcüzələrdəndir;

– Yağışın yağması üçün Peyğəmbər (s.ə.s) kimi dua etmək (müstəhəbdir);

– Allahdan qorxan, saleh insanın tələbini nəzərə alıb dua etmək (caizdir).

## İyirmi üçüncü fəsil: «Qorxu namazı»

159. Abdullah ibn Ömər ibni-l-Xəttab (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) döyüşdə düşmənlə qarşılaşdığımız zaman bizə qorxu namazı qıldırardı. Bir dəstə səhabə onunla namaza başlayar, o biri dəstə isə onları qoruyardı. Bir rükət qıldıqdan sonra isə dəstələr yerlərini dəyişər və Peyğəmbər (s.ə.s) ikinci rükəti tamamlayardı. Daha sonra isə hər dəstə

[1] Mədinə şəhərindəki dağın adıdır.

(əvvəlcə ikinci dəstə, sonra da birinci dəstə) qalan bir rükəti tamamlayardı» (əl-Buxari, 942; Müslim, 1939).

159-cu hədisdən çıxarılan nəticələr:

– Hər hansı bir təhlükəli səbəbə görə qorxu namazı qılmaq;

– Bu namazı hədisdə göstərilən qaydada qılmaq;

– Zəruriyyət üçün namazda artıq hərəkət etmək onu batil etmir;

– Qorxu, təhlükə olsa belə namazları vaxtında və camaat şəklində qılmaq üçün səy göstərmək;

– Düşməndən ehtiyat etmək.

160. Yezid ibn Rumən, Saleh ibn Xavvət ibn Cubeyrdən, o da Peyğəmbər (s.ə.s) ilə bərabər «Zatu-r-Riqa» döyüşündə qorxu namazı qılan səhabədən rəvayət edir ki, «Bir dəstə, Peyğəmbər (s.ə.s) ilə bərabər namaza başladı, o biri dəstə isə (onları qorumaq üçün) düşmənə tərəf döndü. Peyğəmbər (s.ə.s) bir rükət qıldıqdan sonra ayağa qalxıb səhabələr ikinci rükəti sərbəst tamamlayana qədər hərəkətsiz dayanıb gözlədi. Dəstələr yerlərini dəyişdirdikdən sonra ikinci rükəti qıldı və o biri dəstə ikinci rükəti tamamlayana qədər hərəkətsiz dayanıb gözlədi. Sonra isə (onlardan əvvəl) salam verib namazı tamamladı» (əl-Buxari, 4129; Müslim, 1944).

Müəllif deyir ki, «Peyğəmbər (s.ə.s) ilə bərabər namaz qılan səhabə Səhl ibn Əbi Həsmətədir (r.a)».

160-cı hədisdən çıxarılan nəticələr:

– Qorxu namazı müxtəlif keyfiyyətlərdə varid olmuşdur. Lakin Malik, Şafii, Əhməd və s. islam alimləri bu hədisdə vəsf olunmuş qaydanı seçmişlər;

– Namazın camaatla birgə qılınması;

– Qorxu namazının hədisdə göstərilən qaydada qılınması;

– Bu namazın əmin-amanlıqda qılınan namazdan fərqlənməsi.

161. Cabir ibn Abdullah əl-Ənsari (r.a) rəvayət edir ki, «Mən Peyğəmbər (s.ə.s) ilə qorxu namazını qıldım. O, bizi iki cərgəyə düzdü və düşmən mövqeyi bizimlə qiblə arasında olduğu vəziyyətdə namaza başladı. Biz onunla bərabər təkbir və ruku etdik, sonra da rukudan qalxdıq. O, birinci səf ilə bərabər səcdə etdiyi zaman ikinci səf düşmənə qarşı dayanıb gözlədi. Onlar (hər iki) səcdəni etdikdən sonra ikinci səf də səcdə etdi. Ayağa qalxdıqdan sonra isə cərgələr yerlərini (1-ci cərgə 2-ci cərgənin, 2-ci cərgə də 1-ci cərgənin yerinə keçməklə) dəyişdirdi və ikinci rükəti də

əvvəlki rükət kimi qıldıq. Sonra isə hamımız onunla bərabər salam verib namazı bitirdik».

Cabir (r.a) deyir ki, «(Onların qıldığı namaz) keşikçilərimizin əmirlərini qoruduğu zaman qıldıqları namaz kimidir» (Müslim, 1943).

Başqa rəvayətdə: «O, Peyğəmbər (s.ə.s) ilə bərabər qorxu namazını yeddinci döyüşdə – Zətu-r-Riqa döyüşündə qıldı» (əl-Buxari, 4125).

161-ci hədisdən çıxarılan nəticələr:

– Peyğəmbərin (s.ə.s) namazı bu qaydada qıldırması onun ədalətli olmasına dəlalət edir;

– Qorxu namazını hədisdə göstərilən qaydada qılmaq.

## İyirmi dördüncü fəsil: «Cənazələr»

162. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Nəcaşinin[1] ölüm xəbərini elan etdikdən sonra namaz qılınan yerə gəldi, cərgələri düzdü və dörd təkbirli (rüku və səcdəsiz) namaz qıldı» (əl-Buxari, 1333; Müslim, 2201).

163. Cabir (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Nəcaşinin (cənazə) namazını qıldığı zaman mən ikinci və ya üçüncü səfdə idim» (əl-Buxari, 3878).

164. Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) meyit dəfn olunduqdan sonra qəbrin önündə dayanıb dörd təkbirli (rüku və səcdəsiz) namaz qıldı» (Müslim, 2208).

162-ci, 163-cü və 164-cü hədislərdən çıxarılan nəticələr:

– Qəriblikdə ölən şəxs üçün (cənazəni müşahidə etməyərək) qılınan cənazə namazının hökmü:

a) Əbu Hənifə və Malikin rəyinə görə belə namaz qılmaq caiz deyildir. Peyğəmbərin (s.ə.s) Nəcaşi üçün qıldığı cənazə namazı isə ona (s.ə.s) məxsusdur.

b) Şafiinin rəyinə görə isə belə namaz qılmaq caizdir. İmam Şafii bu hədislərə əsaslanıb belə nəticə çıxarmışdır.

v) Əhməd ibn Hənbəl, İbn Teymiyyə, İbnu-l-Qeyyim, Əbdürrəhman əs-Sədi və s. alimlərin rəyi müfəssəldir. Belə ki, qürbətdə ölən şəxs üçün

---

[1] Bu, Həbəşistan krallarının tituludur. Qeyd olunanın adı Əshəmədir.

cənazə namazı qılınıbsa, qeyriləri üçün bu namazı qılmaq vacib deyildir. Əks halda isə, cənazə müşahidə olunmasa belə, bu namazı qılmaq vacibdir.

Qeyd etmək lazımdır ki, üçüncü rəy ən mötəbər rəy sayılır.

– Cənazə namazını qılmaq fardu-l-kifayədir;

– Cənazə namazının dörd təkbirdən ibarət olması. Birinci təkbirdən sonra Fatihə surəsi, ikinci təkbirdən sonra salavat, üçüncü təkbirdən sonra mərhum üçün dua oxunur və dördüncü təkbirdən sonra isə salam verməklə namaz tamamlanır.

Qeyd etmək lazımdır ki, bu namazda rüku və səcdə edilmir.

– Cənazə namazını qılanların sayı lap çox olarsa, onu bayram namazının qılındığı yerdə qılmaq müstəhəbdir;

– Namaz qılanların sayının çox olması vəfat edən şəxsin xeyrinədir;

– Ölən şəxsin kim (kişi, qadın və ya uşaq) olduğu namaz qılanlara bildirilməlidir.

165. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) (vəfat etdikdən sonra) ağ rəngli, tərtəmiz üç Yəmən sarğısı (kəfən) ilə sarındı. Bu sarğıların arasında köynək və əmmamə yox idi» (əl-Buxari, 1264; Müslim, 2177).

165-ci hədisdən çıxarılan nəticələr:

– Peyğəmbərin (s.ə.s) kəfəninin üç sarğıdan ibarət olması;

– Kəfənin ağ və təmiz olması. (müstəhəbdir)

Qeyd: qadının kəfəni beş sarğıdan ibarətdir.

166. Ummu Atiyyə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) qızı Zeynəb (r.a) vəfat etdikdən sonra bizim yanımıza gəlib dedi: "Zeynəbi üç, ya beş, ya da (ehtiyac varsa) bundan da çox su, sidr[1] və kafur[2] ilə yuyun. Qurtardıqdan sonra mənə xəbər verin. Biz onu yuyub qurtardıqdan sonra Peyğəmbəri (s.ə.s) çağırdıq. O, izarını (paltarın aşağı hissəsi) onlara verib dedi: "Onu buna sarıyın!"» (əl-Buxari, 1257; Müslim, 2165).

Başqa rəvayətdə: «…üç, ya beş, ya da yeddi dəfə…» (əl-Buxari, 1259; Müslim, 2168).

Başqa rəvayətdə Peyğəmbər (s.ə.s) əmr edib deyir: «Sağ tərəfindən, dəstəmazda yuyulan əzalarından başlayın…» (əl-Buxari, 1256; Müslim, 2172).

Başqa rəvayətdə Ummu Atiyyə deyir ki, «Saçlarını üç hörük hördük» (əl-Buxari, 1259; Müslim, 2168).

---

[1] Şam fəsiləsindən olub, həmişəyaşıl iynəyarpaqlı ağacdır.
[2] Ətir növü. Kafur: dəfnəkimilər fəsiləsindən həmişəyaşıl ağacdır.

166-cı hədisdən çıxarılan nəticələr:
– Müsəlman meyitini qüsl etmək fərdu-l-kifayədir;
– Qadını yalnız qadın, kişini də yalnız kişi yumalıdır. Yalnız ər-arvad müstəsnadır. Belə ki, onlardan biri digərini yuya bilər;
– Meyiti üç və ya daha çox tək sayda yumaq;
– Qüsl etdikdə sidr və kafurdan istifadə etmək;
– Qüsl etdikdə sağ tərəfdən – dəstəmazda yuyulan əzalardan başlamaq;
– Qadının saçlarını üç hörük hörmək;
– Ancaq Peyğəmbərə (s.ə.s) məxsus olan bir şeyin (paltarın, saçı, aldığı su və s.) vasitəsilə bərəkətə nail olmaq olar.

167. Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Bir kişi Ərafada[1] mindiyi heyvanın üzərindən yerə düşdü və boynu sındı. (Vəfat etdikdən sonra) Peyğəmbər (s.ə.s) dedi: "Onu su və sidr ilə yuyub iki sarğı (kəfən) ilə sarıyın. Onu ətirləməyin və başını da örtməyin həqiqətən, o, Qiyamət günü təlbiyə[2] edərək diriləcək"» (əl-Buxari, 1265; Müslim, 2884).

167-ci hədisdən çıxarılan nəticələr:
– Ehramda[3] ikən ölən şəxsi qüsl etmək;
– Qüsl etdikdə sidrdən istifadə etmək;
– Meyiti kəfənləmək;
– Ehramda ikən ölən şəxsi ətirləməmək;
– Başını örtməmək;
– Meyiti iki sarğı ilə kəfənləmək.
Qeyd: iki sarğı dedikdə, göbəkdən aşağı və ondan yuxarı olan sarğılar nəzərdə tutulur. Bundan belə nəticə çıxır ki, meyiti bir qat kəfənə bükmək kifayətdir.

168. Ummu Atiyyə əl-Ənsariyyə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) bizə (qadınlara) cənazəni təqib[4] etməyi qadağan etdi, lakin haram olmasını təkid etmədi» (əl-Buxari, 1278; Müslim, 2164).

---

[1] Məkkənin yaxınlığında yerləşən dağ və onun ətrafında olan yerin adıdır. Həmçinin, zi-l-hiccə ayının 9-u Ərafa günü adlanır.
[2] Bu duanı oxumaq: «ləbbeyk-əllahummə ləbbeyk, ləbbeykə lə şərikə ləkə ləbbeyk, innə-l-həmdə va-n-ni‘mətə ləkə va-l-mulk lə şərikə lək».
[3] Ehram – niyyət edib Həcc mərasiminə başladıqdan bayram gününə qədər olan vaxtdır.
[4] Təqib – cənazəni qəbiristanlığa qədər müşayiət etmək və dəfn mərasimində iştirak etməkdir.

168-ci hədisdən çıxarılan nəticələr:

– Cənazəni təqib etməyin qadınlara qadağan olması;

– Qadına cənazəni təqib etməyin qadağan edilməsinə səbəb, onun bu anda səbr etməməsidir.

169. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Cənazəni (ölən şəxsi) dəfn etməyə tələsin! Həqiqətən, o, saleh olarsa, siz (ona) xeyir nəsib etmiş, əks halda isə şəri boynunuzdan atmış olarsınız"» (əl-Buxari, 1315; Müslim, 2183).

169-cu hədisdən çıxarılan nəticələr:

– Meyiti dəfn etməyə tələsmək. Bir şərtlə ki, tələsməkdən meyitə və ya onu aparanlara zərər toxunmasın;

– Əməlisaleh insanların cənazəsini təqib etmək və günahkarlardan uzaqlaşmaq.

170. Səmurə ibn Cundəb (r.a) rəvayət edir ki, «Mən Peyğəmbər (s.ə.s) ilə nifasdan[1] vəfat etmiş qadının cənazə namazını qıldım. O, namazda ikən (axıra qədər) meyitin orta nahiyəsində dayandı» (əl-Buxari, 1331; Müslim, 2234).

170-ci hədisdən çıxarılan nəticələr:

– Qadın üçün cənazə namazının qılınması;

– Qadın üçün qılınan namazda kişidən fərqli olaraq imam üzü qibləyə cənazənin orta nahiyəsində dayanmalıdır[2];

– Doğuş zamanı vəfat etmiş qadın şəhid sayılsa belə, onun üçün cənazə namazı qılınmalıdır. Çünki Allah yolunda vuruşub şəhid olanla bu şəhidlik rütbəsi fərqlidir.

171. Əbu Musa Abdullah ibn Qeys əl-Ənsari (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s), meyit üçün ağlayan zaman səsini qaldıran, saçını qırxan (və ya yolan) və paltarını cıran qadından uzaq idi[3]» (əl-Buxari, 1296; Müslim, 283).

171-ci hədisdən çıxarılan nəticələr:

---

[1] Nifas – uşaq doğduqdan sonra, adətən qırx günə qədər qadının fərcindən gələn qana deyilir. Nifasdan: yə‘ni, nifas olan müddətdə və ya nifas qanından ya da doğuşda.

[2] Kişi üçün cənazə namazı qıldıran imam meyitin baş tərəfində dayanmalıdır.

[3] Günah etməkdə onlara şərik olmazdı.

– Saç yolmaq, paltar cırmaq, qışqırmaq və s. bu kimi bəyənilməyən əməllərlə Allahın yazdığı qədərə etiraz etməyin haram olması;

– Cəhalət əhlinin şəriətə müxalif olan əməllərinə təqlid etməyin haram olması;

– Hədisdə qeyd olunan əməllərin böyük günahlardan sayılması;

– Həddi aşmayaraq həzin-həzin ağlamağın caiz olması. Peyğəmbər (s.ə.s) oğlu İbrahim vəfat etdikdə onun üçün ağlaması buna dəlildir.

Müsibətə düçar olmuş hər bir müsəlmana aşağıdakı ayə və hədisi xatırlatmaq ona fayda verər.

Uca Allah buyurur:

وَلَنَبْلُوَنَّكُمْ بِشَيْءٍ مِنَ الْخَوْفِ وَالْجُوعِ وَنَقْصٍ مِنَ الْأَمْوَالِ
وَالْأَنْفُسِ وَالثَّمَرَاتِ ۗ وَبَشِّرِ الصَّابِرِينَ ﴿١٥٥﴾ الَّذِينَ إِذَا
أَصَابَتْهُمْ مُصِيبَةٌ قَالُوا إِنَّا لِلَّهِ وَإِنَّا إِلَيْهِ رَاجِعُونَ ﴿١٥٦﴾ أُولَٰئِكَ
عَلَيْهِمْ صَلَوَاتٌ مِنْ رَبِّهِمْ وَرَحْمَةٌ ۖ وَأُولَٰئِكَ هُمُ الْمُهْتَدُونَ ﴿١٥٧﴾

«Əlbəttə, Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal, can və məhsul qıtlığı ilə imtahan edərik. Səbr edən şəxslərə müjdə ver! O kəslər ki, başlarına bir müsibət gəldiyi zaman: "Biz Allahın bəndələriyik və (öləndən sonra) Ona tərəf (Onun dərgahına) qayıdacağıq!" – deyirlər. Onları Rəbbi tərəfindən bağışlanmaq və rəhmət gözləyir. Onlar doğru yoldan olanlardır» («əl-Bəqərə» surəsi, 155-157).

Süheyb (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Mömin bəndənin hər bir əməli qəribə və onun üçün xeyirlidir. Bu da yalnız möminə məxsusdur. Ona nemət əta olunduqda ona şükr edir, bəla gəldikdə isə ona səbr edir və hər ikisi onun üçün xeyirli olur».

172. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbərin (s.ə.s) zövcəsi Ummu Sələmə (r.a) və Ummu Həbibə (r.a) Həbəşistandakı Mariya adlı kilsənin gözəl olduğunu və içərisindəki şəkilləri müşahidə etməsini ölümqabağı ona xəbər verdilər, O, başını qaldırıb dedi: "Onlar vəfat etmiş saleh insanın qəbrinin üzərində məscid tikir, sonra da içərisində onun şəklini təsvir edirlər. Onlar Allah yanında məxluqatın şərlisi hesab olunurlar» (əl-Buxari, 1341; Müslim, 1181).

172-ci hədisdən çıxarılan nəticələr:

– Qəbrin üzərində məscid və ya ona bənzər tikili tikməyin qadağan olunması;

– Məscidin içərisində şəkil təsvir etməyin qadağan olunması;

– Bunu edənlərin Allah yanında ən şərli insanlardan hesab olunması.

173. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) ölümqabağı demişdir: "Allah yəhudi və nəsranilərə, peyğəmbərlərinin qəbrləri üzərində məscid bina etdiklərinə görə lənət etmişdir"».

Aişə deyir ki: «Bunu deməsə idi evimdən xaric bir yerdə dəfn edilərdi» (əl-Buxari, 1330; Müslim, 1184).

173-cü hədisdən çıxarılan nəticələr:

– Qəbrin üzərində məscid və ya ona bənzər tikili tikməyin qadağan olunması;

– Peyğəmbərin (s.ə.s) yəhudi və nəsranilərin (xristianların) etdikləri günah barəsində xəbər verməsi;

– Qəbrin yanında qılınan namazın böyük şirkə aparan vasitələrdən olması;

– Allah Peyğəmbərini (s.ə.s) şirk üçün vasitə olmaqdan qorumuşdur.

– Bu, Peyğəmbərimizin (s.ə.s) ölüm anında etdiyi vəsiyyətlərdəndir.

Bir çoxları əl-Kəhf surəsinin 21-ci ayəsinə əsaslanaraq islam dinində qəbrin üzərində məscidin tikilməsinə icazə verir. Uca Allah bu ayədə demişdir:

فَقَالُوا ابْنُوا عَلَيْهِم بُنْيَانًا رَّبُّهُمْ أَعْلَمُ بِهِمْ قَالَ الَّذِينَ
غَلَبُوا عَلَىٰ أَمْرِهِمْ لَنَتَّخِذَنَّ عَلَيْهِم مَّسْجِدًا ﴿٢١﴾

«(Nəhayət, əshabi-kəhf öldükdən sonra kafirlər) dedilər: "Onların üstündə bir bina tikin. Rəbbi (onların öldüyünü, yaxud yenidən yuxuya getdiyini və nəyə etiqad etdiklərini) daha yaxşı bilir". (Əshabi-kəhf haqqındakı mübahisədə) qalib gələnlər isə: "Onların (məzarı) üstündə (Allaha ibadət etmək məqsədilə) bir məscid tikəcəyik" – dedilər».

Bunun izahı isə belədir:

1) Bu anlayış Peyğəmbərdən (s.ə.s) varid olan mötəbər hədislərə ziddir;

2) Ehtimal var ki, bu əməl onların şəriətinə görə caiz olub. Lakin qeyd etmək lazımdır ki, bu çox zəif ehtimaldır;

3) Allahın onlar haqqında xəbər verməsi heç də bu əməlin müsəlmanlara vacib və ya müstəhəb olmasına dəlalət etmir;

4) «Onların üstündə bir məscid tikəcəyik» – ifadəsinin kim tərəfindən deyildiyi dəqiq məlum deyildir;

5) Ayədə onların məscid tikmək istəyi qeyd olunub, lakin tikib-tikmədikləri məlum deyildir.

174. Abdullah ibn Məs‘ud (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "(Ölən şəxs üçün ağladıqda) üz-gözünə döyən[1], paltarını cıran və cahiliyyə dövründən qalan sözləri[2] işlədən bizdən deyildir[3]"» (əl-Buxari, 1294; Müslim, 281).

174-cü hədisdən çıxarılan nəticələr:

– Üz və sinəyə vurmaq, paltarı cırmaq və cahillərin Allahın qədərinə etiraz əlaməti olaraq istifadə etdikləri kəlmələri deməyin qadağan olunması;

– Hədisdə qeyd olunan əməllərin böyük günahlardan sayılması.

175. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Cənazəni müşahidə[4] edib namazını qılana bir, (ondan sonra) dəfn olunana qədər onu təqib edənə isə iki qirat qədər savab yazılır". Səhabələr: "İki qirat nə qədərdir?" – deyə soruşduqda, Peyğəmbər (s.ə.s): "İki böyük dağ kimidir" – deyə cavab verdi» (əl-Buxari, 1325; Müslim, 2186).

Başqa rəvayətdə: «Qiratların ən kiçiyi Uhud dağı kimidir» (Müslim, 2189).

175-ci hədisdən çıxarılan nəticələr:

– Meyitə cənazə namazını qılıb onu dəfn olunana qədər təqib edən böyük savab qazanır,

– Bunu edənin nə qədər savab qazandığını yalnız Allah bilir;

– Peyğəmbərin (s.ə.s) ümmətini bu iki əməli etməyə rəğbətləndirməsi, Allahın meyitə bəxş etdiyi nemətdir. Belə ki, namaz qılıb təqib edənlərin sayı çox olduqca, meyit üçün dua edib bağışlanma diləyənlərin sayı da çox olar;

– Müsəlmanın qazandığı savabın nisbəti əməllərinin nisbətilə ölçülür. Belə ki, Peyğəmbər (s.ə.s) meyitə cənazə namazını qılanın bir qirat, bununla belə onu dəfn olunana qədər təqib edənin isə iki qirat savab qazanması haqqında xəbər vermişdir.

---

[1] Həmçinin, bədəninin başqa əzalarınıa əziyyət verən.

[2] Aslanım, igidim, mələyim, canım və s.

[3] Yəni, bizim sünnətdən, yoldan. Qeyd: bu əməlləri edən islamdan xaric olmur, kafir sayılmır.

[4] Meyitin yuyulub kəfənlənməsində iştirak etmək.

***Xülasə***

Namazın rüknləri:
– qiyam (namazı ayaq üstə qılmaq);
– təkbirlə (Allahu əkbər deməklə) namaza başlamaq;
– Fatihə surəsini oxumaq;
– rüku etmək;
– rükudan qalxıb dikəlmək;
– səcdə etmək;
– səcdədən qalxıb oturmaq (yalnız iki səcdə arasında);
– bu hərəkətləri (rahatlıqla) tələsmədən etmək;
– axırıncı rükətdə təşəhhüd demək üçün oturmaq;
– axırıncı rükətdə təşəhhüdü oxumaq;
– bu hərəkətləri tərtiblə ( ardıcıllıqla) etmək;
– salam ilə namazı tamamlamaq.

Bu rüknlərdən hər hansı birini bilərəkdən tərk edənin namazı batil olur. Lakin səhvən bu rüknlərdən bəzilərini tərk edən tərk etdiyi rüknə görə yenidən bir rükət əlavə qılmalı və səhv səcdəsi etməlidir. Namazı çox tez qılan, yaxud ayaq üstə qılmaq imkanı ola-ola oturaq qılan və yaxud ilk təkbiri etməyən namazı yenidən tam qılmalıdır.

Namazın vacibləri:
– ehram təkbirindən (namazı başladıqda edilən təkbirdən) başqa olan təkbirlər;
– «səmi-Allahu limən həmidəh» demək;
– «Rabbənə və ləkəl həmd» demək;
– «sübhanə Rabbiyə-l-azım» demək;
– «sübhanə Rabbiyə-l-ələ» demək;
– «Rabbi-ğ-firli» demək;
– dörd və üç rükətli namazın ikinci rükətindən sonra oturmaq;
– dörd və üç rükətli namazın ikinci rükətindən sonra təşəhhüdü oxumaq.

Bu vaciblərdən hər hansı birini bilərəkdən tərk edənin namazı batil olur. Lakin səhvən bu vaciblərdən birini tərk edən tərk etdiyi vaciblərə görə yalnız iki dəfə səhv səcdəsi etməlidir.

Namazın şərtləri:
– müsəlman olmaq;
– həddi-buluğa çatmaq;

– ağıllı (nə dediyini və etdiyini qavramaq qabiliyyətində) olmaq;

– təharətli olmaq (qüsl və ya dəstəmazlı, və ya onları əvəz edən təyəmmümlü olmaq);

– hər namazı vaxtında qılmaq;

– paltarı, bədəni və namaz qılınan yeri nəcasətdən (murdarlıqdan) təmizləmək;

– ayıb yerlərini (övrəti) örtmək;

– qibləyə tərəf durmaq.

Aşağıdakı hallarda qibləyə tərəf durmaq şərt deyil:

a) qorxu olduqda (düşməndən, vəhşi heyvandan və s.);

b) aciz olduqda (xəstəlik, məcburiyyət və s.);

v) fərz namazlarından başqa minik üzərində qılınan nafilə namazlarında;

– hər namaz üçün (qəlbdə) niyyət etmək.

Bilərəkdən bu şərtlərdən birini tərk edənin namazı batildir.

Namazın sünnələri (müstəhəbləri):

– istiftah (Fatihə surəsindən qabaq oxunan dua);

– «bismilləhi-r-rahməni-r-rahim» demək;

– «Amin» demək;

– Fatihə surəsindən sonra oxunan hər hansı bir surə;

– sübh, məğrib, işa və s. səsli namazlarda səslə oxumaq;

– «sübhanə Rabbiyə-l-azım» duasını bir dəfədən artıq oxumaq;

– rükuda bu duadan başqa oxunan dualar;

– sonuncu təşəhhüddə salavatdan sonra oxunan dualar;

– əlləri qaldırmaq (təkbir edərək namaza daxil olduqda, rüku etdikdə, rükudan və təşəhhüddən sonra üçüncü rükətə qalxdıqda);

– sağ əl sol əlin üzərində olmaqla əlləri sinənin üzərinə qoymaq;

– səcdə yerinə baxmaq;

– birinci rükətin ikinci rükətdən, ikinci rükətin üçüncü rükətdən, üçüncü rükətin də dördüncü rükətdən uzun olması;

– təşəhhüddə və ikinci, dördüncü rükətlərə qalxmazdan əvvəl sol ayaq üzərində oturmaq və sağ ayağın barmaqlarını qibləyə tərəf yönəltmək;

– təşəhhüddə işarə barmağını qibləyə tərəf yönəltmək və ya onu tərpətmək;

– rükuda, əlləri açıq vəziyyətdə dizdən tutmaq;

– «sübhanə Rabbiyə-l-ələ» duasını bir dəfədən artıq oxumaq;

– «Rabbi-ğ-firli» duasını bir dəfədən artıq oxumaq;

– Peyğəmbərə (s.ə.s) salavat gətirmək.

Bu sünnələrin birini tərk etmək namazı batil etmir və səhv səcdəsi etmək də lazım gəlmir, yalnız namaz qılan artıq savab qazanmır.

Namazda bəyənilməyən əməllər:

– yuxarı baxmaq;
– səbəbsiz yerə başı döndərmək;
– namazdan yayındıran şeylərə baxmaq;
– əlləri belə qoymaq;
– səcdədə dirsəkləri yerə qoymaq;
– gözləri yummaq;
– səbəbsiz yerə artıq hərəkətlər etmək (qaşınmaq, tərpənmək və s.);
– süfrədə yemək olduqda namaz qılmaq;
– eyni rükətdə Fatihəni təkrar oxumaq;
– sidiyi, havanı və s. saxlayaraq ayaqyoluna getməmək.

Bu məkruhlardan birini etmək namazı batil etmir və səhv səcdəsi etmək də lazım gəlmir, yalnız namaz qılan artıq savab qazanmır.

Namazı batil edən şeylər:

– namaz əsnasında (namazdan kənar danışmaq;
– ərkan, vacib və şərtlərdən hər hansı birini qəsdən tərk etmək.

Ərkanlardan birini bilməyərəkdən tərk etmək də namazı batil edir.

## ÜÇÜNCÜ BÖLMƏ: ZƏKAT

176. Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Müaz ibn Cəbəli (r.a) Yəmənə göndərdikdə ona demişdir: "Sən kitab əhlindən olan bir qövmün yanına gedirsən, elə isə onları (tövhidə) "əşhədü ən lə iləhə illəllahu və əşhədü ənnə Mühəmmədən rəsulullah" kəlməsinə dəvət et. Buna itaət edərlərsə, o qövmə xəbər ver ki, Allah onlara gün ərzində beş vaxt namaz qılmaqlarını fərz[1] buyurmuşdur. Buna itaət edərlərsə, o qövmə xəbər ver ki, Allah onlara varlılarından götürülüb kasıblarına paylanan sədəqənin (zəkatın) verilməsini fərz buyurmuşdur. Buna da itaət edərlərsə, onların ən qiymətli mallarını götürməkdən çəkin! Habelə, məzlumun duasından qorx! Həqiqətən, onun duası ilə Allahın arasında heç bir maneə yoxdur» (əl-Buxari, 1395; Müslim, 121).

176-cı hədisdən çıxarılan nəticələr:
– Peyğəmbərin (s.ə.s) səhabələrinə dəvətin üslubunu öyrətməsi;
– Qeyri-müsəlmanla münaqişə etmək və onda olan şübhələri rədd etmək üçün hazırlaşmaq;
– Hikmətlə dəvət etməyin üslublarını öyrənmək;
– Dəvət etdikdə ən mühüm əmrlərdən başlamaq;
– Tövhidin ən mühüm əmr sayılması. Belə ki, Uca Allah onsuz heç bir ibadəti qəbul etmir;
– Beş vaxt qılınan namazlar dinin dayağı olduğu üçün tövhiddən sonra ən mühüm əmr hesab olunur;
– Zəkatın da ən mühüm əmr hesab olunması;
– İlk mühüm sayılan əmələ itaət etməmiş sonrakına keçməmək;
– Zəkatın, kasıblar üçün təsəlli və təskinlik olması;
– Zəkat toplayana malın ən qiymətlisindən və ən gözəlindən götürməsi haramdır. Belə ki, götürdüyü zəkat malı nə çox qiymətli və gözəl, nə də ki, çox ucuz və keyfiyyətsiz olmamalıdır;
– Zəkat toplayan zülm etməkdən çəkinməlidir. Belə ki, zülm etmək ən böyük günahlardandır;
– Məzlum kafir olsa belə, onun duasının qəbul olunması;
– Əmr sahiblərinin zəkat toplayanlara nəsihət verməsi;
– Yalnız beş namazın fərz olması;
– Səkkiz sinif[2] (zəkat verilən) insanların yalnız bir qisminə (kasıblara) zəkat verməklə kifayətlənmək caizdir;

---

[1] Hər bir müsəlmana vacib olan əməl.
[2] Bax: Tövbə surəsi, 60.

– Zəkatın yerli varlılardan götürülüb yerli kasıblara paylanılması. Lakin qeyd etmək lazımdır ki, zəkatı yerli sakinlərdən qeyrisinə də vermək caizdir. Çünki, ayədə xatırlanan səkkiz sinifdən biri müsafirdir ki o da yerli sayılmır.

177. Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "İki yüz dirhəmdən[1] az, beş dəvədən az və üç yüz saadan[2] az miqdarda olan maldan sədəqə (zəkat) verilmir"» (əl-Buxari, 1459; Müslim, 2260).

177-ci hədisdən çıxarılan nəticələr:

– Hədisdə göstərilən qədər və ondan çox malı olanın zəkat verməsi vacibdir;

– Hədisdə göstərilən miqdardan az malı olanın zəkat verməsi vacib deyildir;

– Gümüş 595 qrama çatdıqdan sonra əldə olunan məbləğdən onda birin dörddə biri zəkat verilir;

– Beşdən az dəvəsi olana zəkat düşmür

– Dənli bitkinin ümumi çəkisi 612 kq və bundan çox olarsa, ondan zəkat verilir.

178. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Müsəlmana, qulun və atın sədəqəsini (zəkatını) vermək vacib deyildir"» (əl-Buxari, 1464; Müslim, 2270).

Başqə rəvayətdə: «yalnız fitrə sədəqəsini (zəkatını) vermək vacibdir» (Müslim, 2273).

178-ci hədisdən çıxarılan nəticələr:

– Qula zəkat çıxarmağın vacib olmaması;

– Atın zəkat malından sayılmaması;

– Qulun fitrə zəkatını çıxarması onun ağasına vacibdir;

– Artım üçün saxlanılan maldan (dəvə, öküz, qoç, qızıl-gümüş və s.) fərqli olaraq xidmət üçün saxlanılan mala (at, eşşək, maşın, ev və s.) zəkat düşmür.

Qeyd etmək lazımdır ki, yalnız hər hansı mötəbər dəlilə əsalanaraq zəkat malını təyin etmək caizdir.

---

[1] O vaxt mövcud olan gümüş pul, 200 dirhəm = 595 qram gümüşə bərabərdir.

[2] 1 saa: 2 kq. 40 qrama bərabərdir. 300 saa = 612 kq.

179. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Ev heyvanlarına, quyu və mədən üçün zəmanət yoxdur. Xəzinənin(tapılan) zəkatı isə onun beşdə biridir"» (əl-Buxari, 1499; Müslim, 4440).

179-cu hədisdən çıxarılan nəticələr:

– Ev heyvanının sahibindən xəbərsiz ziyan vurduğu yerə (tarla, əkin sahəsi və s.) görə sahibi cavabdehlik daşımır. Lakin bunu sahibinin təşəbbüsü ilə edərsə, o zaman sahibi sığorta ödəməlidir.

– Fəhlə öz istəyi ilə quyuya və ya mədənə düşər və fəlakətə uğrayarsa, buna görə müdiriyyət cavabdehlik daşımır. Lakin fəhləni məcbur edib fəlakətə uğradan şəxs etdiyi əmələ görə məsuliyyət daşıyır.

– Xəzinə tapıldıqda (az və ya çox) onun beşdə biri sədəqə verilməlidir;

– Bu növ sədəqə xəzinə tapılan an verilməlidir;

– Tapılan xəzinənin qiymətindən[1] yox, onun özündən[2] sədəqə verilməlidir;

– Bəzi alimlərin rəyinə görə mülki torpaqdan tapılan xəzinədən sədəqə verilmir. Lakin qeyd etmək lazımdır ki, ehtiyat üçün bu sədəqəni vermək daha əfzəldir.

– Tapılan xəzinə zəkat malından çox qənimətə bənzəyir. Buna görə də onun beşdən birini Allah yolunda hər bir xeyirli əmələ sərf etmək caizdir. Belə ki, bununla zəkat malı arasında bir çox fərqlər vardır ki, bu da aşağıdakı kimidir:

a) Zəkat malı müəyyən vaxtda verilir, xəzinə üçün isə heç bir vaxt təyin olunmamışdır.

b) Zəkat malının qiyməti dəyərində pul vermək caizdir, xəzinənin isə yalnız özündən sədəqə verilməlidir.

v) Zəkat malı müəyyən miqdardan çıxarılır, xəzinə üçün isə belə miqdar təyin olunmayıb.

q) Zəkat yalnız ayədə göstərilən səkkiz sinif insanlara verilir, xəzinənin beşdən biri isə istənilən xeyirxah iş üçün istifadə oluna bilər.

d) Zəkatın miqdarı minimum malın ondan birinin dörddə biri, maksimum da malın ondan biridir. Xəzinədən verilən malın miqdarı isə onun beşdən biridir.

180. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Öməri (r.a) zəkat toplamaq üçün göndərdi. Sonra İbn Cəmil (r.a) Xalid ibnu-l-Vəlid (r.a) və Abbasdan (r.a) (zəkatı vermədiklərinə görə) Peyğəmbərə (s.ə.s)

---

[1] Tapılan xəzinənin beşdə biri dəyərində pul ödəmək.

[2] Qızıl olsa qızıl, gümüş olsa gümüş və s.

şikayət edildikdə, o dedi: "İbn Cəmilin zəkatdan boyun qaçırması yalnız ona görədir ki, o, kasıb ikən Allah onu zəngin etdi. Xalid barəsində isə (şikayət etməklə) siz ona zülm etmiş hesab olunursunuz[1]. Çünki artıq o, malını – döyüş sursatları və s. üçün Allah yolunda sərf etmişdir. O ki qaldı Abbasa, onun zəkatı və onun misli qədər mənim boynumadır. Ey Ömər! Kişinin əmisi, onun atası mislindədir"» (əl-Buxari, 1468; Müslim, 2274).

180-ci hədisdən çıxarılan nəticələr:

– Təyin olunmuş şəxsin hakim tərəfindən zəkat toplamağa göndərilməsi;

– Zəkat verməyənlər barəsində hakimə şikayət etməyin caiz olması;

– Cəhd göstərib zəkat verməkdən imtina edənlərin günah qazanması;

– Allah yolunda sərf edilməsi təyin olunan maldan zəkatın verilməsi;

– İstənilən əşyanın Allah yolunda sərf olunmasını təyin və ya vəsiyyət etmək caizdir;

– Əminin ata mislində olması;

– "O ki qaldı Abbasa…" cümləsində iki növ anlayış var:

a) alimlərin bir qismi deyir ki, bu zəkatın əvvəldən təcili surətdə verilməsinin caiz olmasına dəlalət edir;

b) digər qismi isə deyir ki, bu qeyrisinin əvəzinə zəkat verməyin caiz olmasına dəlalət edir.

Qeyd etmək lazımdır ki, hər iki ehtimal mümkündür.

181. Abdullah ibn Zeyd ibn Asim əl-Mazini (r.a) dedi: «Peyğəmbər (s.ə.s) Hüneyn döyüşündən əldə etdiyi qənimətləri insanlar arasında bölüşdürdü və ənsarlara (Allah onlardan razı olsun!) heç bir şey vermədi. Bu bölgüdən onlara heç nə çatmadığı üçün incidiklərini görən Peyğəmbər (s.ə.s) xitab edərək onlara dedi: "Məgər zəlalət içində olduğunuz halda, Allah sizi mənim vasitəmlə düz yola yönəltmədimi? Sizin qəlbləriniz biri-birindən ayrı idi. Məgər Allah mənim vasitəmlə onları bir-birinə sevdirmədimi? Siz kasıb ikən O mənim vasitəmlə sizi zəngin etmədimi? Məgər Allahın elçisinin bölgüsü ilə razılaşmağa sizə nə isə mane olur?" Ənsarlar Peyğəmbərin (s.ə.s) hər sualına "Allah və rəsulu haqlıdır" – deyə cavab verdilər. Sonra o, yenə xitab edib dedi: "İstəsəydiniz, deyərdiniz ki, "sən bizə bunca nemətlər verdin". İstəmirsiniz ki, insanlar qoç və dəvə əldə etsinlər, siz isə Peyğəmbərlə birgə olasınız? Hicrət olmasa idi mən də ənsarlardan olardım. İnsanlar dərə və vadidə gəzməli olsalar, mən də

[1] Yəni, Allah yolunda öz istəyi ilə malından xərcləyən Xalidin (r.a) zəkatdan boyun qaçırması qeyri-mümkündür.

ənsarların dərə və vadisində gəzərəm. Ənsarlar köynək, insanlar isə onun üzərindən geyinilən libas mislindədir[1]. Həqiqətən, siz məndən sonra belə hallara məruz qalacaqsınız, lakin Qiyamət günü hovuzun ətrafında mənimlə qarşılaşana qədər səbr edin!"» (əl-Buxari, 4330; Müslim, 2443).

181-ci hədisdən çıxarılan nəticələr:

– Qəlbi islam dini ilə tam sabit olmayana qənimətdən pay vermək;

– Məsləhət bilib dinində sabit olanlara qənimətdən pay verməmək;

– Dünya nemətlərinə olan rəğbət iman və ixlası batil etmir. Bir şərtlə ki, bu rəğbət yalnız Allah xatirinə olsun.

– Münasib yerdə lazım gəldikdə haqqı bəyan etmək üçün moizə vermək;

– Əməlin hansı məqsədlə edilməsini bəyan etməyin hikmətdən sayılması;

– Peyğəmbərin (s.ə.s) səhabələrlə, xüsusən də ənsarlarla mülayim davranması;

– Peyğəmbərin (s.ə.s) ənsarlara qeybdən, gələcəkdə baş verəcək hadisələrdən xəbər verməsi onun möcüzələrindəndir;

– Çətinliklərə səbr etmək, Qiyamət günü Peyğəmbər (s.ə.s) ilə hovuz ətrafında qarşılaşmaq üçün amildir.

## Fitrə zəkatı

182. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) xurma və ya arpadan bir saa qədər fitrə – və ya Ramazan – zəkatını verməyi kişi, qadın, azad və qul olan müsəlmanlara fərz buyurdu. Sonra insanlar yarım saa buğda verməyi ona bərabər etdilər» (əl-Buxari, 1507; Müslim, 2277).

Başqa rəvayətdə: «Peyğəmbər (s.ə.s) fitrə zəkatını camaat bayram namazına gəlməmişdən qabaq ödəməyi əmr etmişdir» (Müslim, 2285).

183. Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, «Biz Peyğəmbərin (s.ə.s) zamanında bir saa miqdarında yeyinti məhsulu, ya xurma, ya arpa, ya kəsmik (və ya şor), ya da kişmişdən fitrə zəkatı verərdik. Müaviyənin (r.a) zamanında buğda ortaya çıxdıqda, o dedi: "Bir mud[2] buğda iki mud arpaya bərabərdir". Əbu Səid (r.a) dedi: "Mən Peyğəmbərin (s.ə.s)

[1] Peyğəmbər (s.ə.s) ənsarların ona daha yaxın olduğunu göstərmək üçün belə misal çəkib.

[2] Bir mud 510 qrama bərabərdir.

zamanında olduğu miqdarda[1], fitrə zəkatını verəcəyəm"» (əl-Buxari, 1508; Müslim, 2280, 2281).

182-ci və 183-cü hədislərdən çıxarılan nəticələr:
– Fitrə zəkatının verilməsi vacibdir;
– Bu zəkatı vermək hər bir kişi və qadın, uşaq və böyük, azad və qul olan müsəlmanlara vacibdir;
– Ana bətnində olan uşağın yerinə fitrə zəkatını çıxartmaq vacib deyildir;
– İcmanın (Malik, Şafii, Əhməd və s.) rəyinə görə, fitrə zəkatının miqdarı bir saadan az olmamalıdır;
– Fitrə zəkatı bayram namazından əvvəl çıxardılıb kasıblara paylanmalıdır.

***Xülasə***

Zəkat vermək hər bir var-dövlətli, azad müsəlman üçün vacibdir.

Əldə edilən, yığılmış malın[2] zəkatını vermək üçün onun üzərindən bir il keçməli və ilin tamamında zəkat çıxardılmalıdır.

Dənli bitkilər (buğda, arpa, düyü və s.) və saxlanılması mümkün olan meyvələrin (qoz, fındıq, şabalıd, badam və s.) zəkatı yığım günü verilməlidir (bax: «əl-Ənam» surəsi, 141).

Zəkat malı dörd qismə bölünür:
1) mal-qara, 2) qızıl və gümüş, 3) bitkilər, 4) ticarət malı.

Zəkat verilən insanlar səkkiz qismə bölünür:
1) yoxsul, 2) miskin, 3) zəkatı yığıb paylayan, 4) ürəyi islama isinişib bağlanan, 5) azad ediləcək kölə, 6) borclu olan, 7) Allah yolunda cihad edən, 8) pulu qurtarıb yolda qalan müsafir (Bax: «Tövbə» surəsi, 60).

Mal-qaranın zəkatı:

---

[1] Yəni, buğdadan da bir saa verəcəyəm.
[2] Qızıl-gümüş, mal-qara və ticarət malı.

Dəvə (erkək və ya dişi, qoca və ya cavan heyvan olması heç bir əhəmiyyət kəsb etmir)

| **Sayı** | **Çıxarılan zəkatın miqdarı** |
|---|---|
| | |
| 5-dən 9-a qədər | 1 qoç |
| 10-dan 14-ə qədər | 2 qoç |
| 15-dən 19-a qədər | 3 qoç |
| 20-dən 24-ə qədər | 4 qoç |
| 25-dən 35-ə qədər | 1 ədəd 1 illik dişi dəvə |
| 36-dan 45-ə qədər | 1 ədəd 2 illik dişi dəvə |
| 46-dan 60-a qədər | 1 ədəd 3 illik dişi dəvə |
| 61-dən 75-ə qədər | 1 ədəd 4 illik dişi dəvə |
| 76-dan 90-a qədər | 2 ədəd iki illik dişi dəvə |
| 91-dən 120-yə qədər | 3 ədəd üç illik dişi dəvə |

Dəvələrin sayı 121 və ondan çox olarsa hər 40 dəvəyə 1 ədəd 2 illik dişi dəvə və hər 50 dəvəyə 1 ədəd 3 illik dişi dəvə zəkat verilir. Bu bölüm Ənəs ibn Malikin (r.a) rəvayət etdiyi hədisdə qeyd olunmuşdur[1].

Öküz (erkək və ya dişi, qoca və ya cavan heyvan olması heç bir əhəmiyyət kəsb etmir)

| **Sayı** | **Çıxarılan zəkatın miqdarı** |
|---|---|
| | |
| 30 maldan | 1 ədəd 1 illik dişi və ya erkək mal |
| 40 maldan | 1 ədəd 2 illik dişi mal |
| 50 maldan | 1 ədəd 2 illik dişi mal |

Malın sayı 60 və ya ondan çox olarsa, hər 30 maldan 1 ədəd 1 illik dişi və ya erkək və hər 40 maldan 1 ədəd 2 illik dişi mal zəkat verilir. Bu bölüm Müaz ibn Cəbəlin (r.a) rəvayət etdiyi hədisdə[2] qeyd olunmuşdur.

Onluqların (30, 40, 50 və s.) arasındakı saylara (32, 35, 46 və s. kimi) zəkat düşmür.

Qoç (erkək və ya dişi, qoca və ya cavan heyvan olması heç bir əhəmiyyət kəsb etmir)

[1] Bax: «Səhihu-l-Buxari», 1454-cü hədis.
[2] Bax: Əhmədin «Müsnəd» əsəri, 5/230; Əbu Davud, 1578-ci hədis.

| Sayı | Çıxarılan zəkatın miqdarı |
|---|---|
| | |
| 40-dan 120-yə qədər | 1 qoç |
| 121-dən 200-ə qədər | 2 qoç |
| 201-dən 300-ə qədər | 3 qoç |

Qoyunların sayı 300 keçərsə, hər yüz qoyuna bir ədəd qoç zəkat verilir. Bu bölüm Ənəs ibn Malikin (r.a) rəvayət etdiyi hədisdə[1] qeyd olunmuşdur.

Qeyd: a) zəkat verilən heyvanın eybi olmamalıdır; b) yalnız otarılan heyvanlardan yuxarıdakı bölümdə zəkat çıxarılır.

Bitkilərin zəkatı:

| Bitkinin növü | Çıxarılan zəkatın miqdarı |
|---|---|
| | |
| Yağış, çay və s. təbii sularla özbaşına sulanan bitkilər | Yığılan məhsulun ondan bir hissəsi |
| Sahibi tərəfindən (onun əziyyəti ilə) sulanan bitkilər | Yığılan məhsulun ondan bir hissəsinin yarısı |

612 kq və ondan artıq miqdarda olan bitkilərdən zəkat verilir. Bundan az miqdarda olduqda isə zəkat düşmür.

Bu bölüm Abdullah ibn Ömər (r.a) və Əbu Səid əl-Xudrinin (r.a) rəvayət etdikləri hədislərdə[2] qeyd olunmuşdur.

Qeyd: tərəvəz və saxlanılması mümkün olmayan meyvələrdən zəkat verilmir.

Qızıl və gümüşün zəkatı:

| Miqdarı | Çıxarılan zəkat |
|---|---|
| | |
| 20 misqal (85 qram) və daha çox qızıla | Ümumi miqdarın ondan birinin dörddən bir hissəsi, yəni 2.5% |
| 200 dirhəm (595 qram) və daha çox gümüşə | Ümumi miqdarın ondan birinin dörddən bir hissəsi, yəni 2.5% |

Bundan az miqdarda olan gümüş və qızıla zəkat düşmür.

[1] Bax: «Səhihu-l-Buxari», 1454-cü hədis.
[2] Bax: «Səhihu-l-Buxari», 1483 və 1484-cü hədislər.

Bu bölüm Əli ibn Əbu Talibin (r.a) və Əbu Səid əl-Xudrinin (r.a) rəvayət etdiyi hədislərdə[1] qeyd olunmuşdur.

Qeyd: Bir çox alimlər ümumi dəlillərə əsaslanaraq ticarət malından zəkat verməyi vacib hesab edirlər. Belə ki, ticarət malı qızıl və gümüş kimi bir ilin tamamında malın ümumi dəyərinin onda birinin 1/4 hissəsi zəkat verilir. Onların əsaslandığı dəlillərin bir qismi bunlardır:

1) Uca Allah buyurur:

وَفِيٓ أَمۡوَٰلِهِمۡ حَقّٞ لِّلسَّآئِلِ وَٱلۡمَحۡرُومِ ١٩

«Mallarında da dilənçinin və yoxsulun haqqı var» («əz-Zariyat» surəsi, 19).

2) Abdullah ibn Abbasın hədisi. (176-cı hədisə bax).

3) Qiyas. Belə ki, ticarət malını satıb əldə edilən pul qızıl və gümüş pula müqayisə olunur.

[1] Bax: Əhmədin «Müsnəd» əsəri, 1/121, 132; «Səhihu-l-Buxari», 1459-cu hədis.

## DÖRDÜNCÜ BÖLMƏ: ORUC

184. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər (s.ə.s) dedi: «Ramazan ayından bir və ya iki gün əvvəl (o günləri xüsusiləşdirib) oruc tutmayın! Lakin, adəti üzrə bu günlərdə oruc tutan şəxs orucunu tutsun» (əl-Buxari, 1914; Müslim, 2514).

184-cü hədisdən çıxarılan nəticələr:
– Ramazan ayından bir və ya iki gün əvvəl o günü xüsusiləşdirərək oruc tutmağın qadağan olunması;
– Hər hansı səbəbə görə bu günlərdə oruc tutmağın caiz olması.

185. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbərin (s.ə.s) belə dediyini eşitdim: "Ramazan ayını (hilalı) gördüyünüz zaman oruc tutun! Şaban ayını (hilalı) gördüyünüz zaman isə orucu tərk edin! Ramazan ayının başlanması sizə bəyan olmadığı halda isə Şaban ayının günlərini tamamlayın"» (əl-Buxari, 1906; Müslim, 2496).
Şərh: Qəməri təvimlə aylarda olan günlərin sayı 29 və ya 30 gündür. Belə ki, Şaban ayının 29-u Ramazan ayının başlanması bəyan olmamışsa, bu ay otuz gündən hesablanır və o gün oruc tutulmur.

185-ci hədisdən çıxarılan nəticələr:
– Ramazan ayının başlanması və bitməsi təzə ayın (hilalın) görünməsi ilə əlaqəlidir;
– Ramazan ayının başlanması və bitməsi bəyan olmadığı halda, bitməsi gözlənilən ayın 30-cu gününü tamamlamaq lazımdır.

186. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Dan yeri ağarana yaxın (səhur vaxtı) orucunuzu açın! Həqiqətən bu vaxt açılan orucun bərəkəti var"» (əl-Buxari, 1923; Müslim, 2544).

186-cı hədisdən çıxarılan nəticələr:
– Dan yeri ağarana yaxın oruc açmağın müstəhəb olması;
– Peyğəmbərin (s.ə.s) əmrini yerinə yetirməklə savab qazanmaq;
– Dan yeri ağarana yaxın qidalanmağın, həmçinin də bu vaxtın bərəkətli olması.

187. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Zeyd ibn Sabit (r.a) dedi: "Biz Peyğəmbərlə (s.ə.s) birlikdə dan yeri ağaranda orucumuzu açıb sonra isə namaz qıldıq". Ənəs (r.a) deyir ki, mən Zeyddən (r.a): "Azanla

yeməyiniz (səhur) arasında olan vaxt nə qədər idi?" – deyə soruşduqda, o dedi: "Əlli ayə miqdarında"» (əl-Buxari, 1921; Müslim, 2547).

187-ci hədisdən çıxarılan nəticələr:
– Dan yeri ağarana yaxın səhur etməyin fəzilətli olması;
– Sübh namazının əvvəl vaxtında qılınması.

188. Aişə (r.a) və Ummu Sələmə (r.a) rəvayət edirlər ki, «Peyğəmbər (s.ə.s) Fəcr namazından əvvəl cinsi əlaqədə olar, sonra isə qüsl edib orucunu tutardı» (əl-Buxari, 1930; Müslim, 2584).

188-ci hədisdən çıxarılan nəticələr:
– Cənabət halında tutulan oruc məqbuldur;
– Həmçinin pollüsiya halında tutulan oruc da məqbuldur;
– Bu məsələdə vacib və nafilə orucları arasında heç bir fərq yoxdur;
– Peyğəmbərin (s.ə.s) zövcələrinin islam ümmətinə qarşı qayğıkeş olmaları.

189. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Oruc tutan şəxs unudub yemək yeyərsə və ya su içərsə, orucunu tamamlasın. Çünki onu yedirib-içirən Allahdır"» (əl-Buxari, 1933; Müslim, 2709).

189-cu hədisdən çıxarılan nəticələr:
– Oruc tutulan müddətdə unudaraq yemək və ya içmək orucu batil etmir. Həmçinin icmanın rəyinə görə, unudaraq cinsi əlaqədə olmaq belə, orucu batil etmir. Bu rəyi dəstəkləyənlər ümumi dəlillərə əsaslanırlar. Əbu Sələmədən (r.a) rəvayət olunan hədisdə Peyğəmbər (s.ə.s) demişdir: «Ramazan ayında unudub orucunu pozan şəxsə nə qəza etmək, nə də kəffarə (cərimə) vermək lazım gəlmir» (İbn Hibban, 906-cı hədis; əl-Hakim, 1/430 – hədis Müslimin şərtinə görə səhihdir. Bax: «İrvau-l-Ğalil», 4/87).
– Oruc tutan şəxs bunları (yemək, içmək və s.) öz ixtiyarı ilə etmədiyi üçün buraxdığı səhvə görə heç bir günah qazanmır;
– «Onu yedirib-içirən Allahdır» – yəni bu iş Allahın yazdığı qədər nəticəsində baş verib.

190. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Biz Peyğəmbərlə (s.ə.s) bir yerdə oturmuşduq. Bu vaxt bir kişi gəlib ona dedi: "Həlak oldum, ey Allahın elçisi". Peyğəmbər (s.ə.s): "Nə olub sənə?" deyə səbəbini ondan

soruşdu. O dedi: "Oruclu ikən zövcəmlə cinsi əlaqədə olmuşam"[1]. Peyğəmbər (s.ə.s) ondan: "Qul azad edə bilərsənmi?" – deyə soruşdu, O, xeyr deyə cavab verdi. Peyğəmbər (s.ə.s): "İki ay ardıcıl oruc tuta bilərsənmi?" – deyə soruşdu. O, xeyr deyə cavab verdi. Peyğəmbər (s.ə.s) ondan: "Altmış yoxsulu (miskini) yedirdə bilərsənmi?" – deyə soruşdu. O, eyrx deyə cavab verdi. Sonra o (s.ə.s), bir qədər susdu. Elə bu zaman səhabələrdən biri ona bir zənbil xurma gətirdi. Peyğəmbər (s.ə.s) zənbili götürüb bayaq sual verən kişiyə uzatdı və dedi: "Götür bunu sədəqə et"[2]. O dedi: "Ey allahın elçisi, məndən də kasıb olana sədəqə edim? Allaha and olsun ki, Mədinədə mənim ailəmdən də kasıb ailə yoxdur". Peyğəmbər (s.ə.s) güldü və dedi: "Elə isə bunu ailənə sədəqə et"» (əl-Buxari, 1936; Müslim, 2590).

190-cı hədisdən çıxarılan nəticələr:

– Ramazan ayının oruc tutulan müddətində qəsdən cinsi əlaqəyə girən kəffarə (cərimə) ödəməlidir;

– Ramazan ayının oruc tutulan müddətində unutqanlıqdan, bilmə-yərəkdən və ya məcburiyyət qarşısında cinsi əlaqəyə girən isə kəffarə (cərimə) ödəməməlidir;

– Kəffarəni ödəyən şəxs, bunu hədisdə göstərilən tərtib üzrə etməlidir;

– Ramazan ayının oruc tutulan müddətində cinsi əlaqədə olmaq müsəlmanı həqiqi mənada həlak edən amillərdən sayılır;

– Kəffarəni ödəmək kasıb olan şəxsə belə vacibdir;

– Başqasının yerinə kəffarə ödəməyin caiz olması;

– Peyğəmbərin (s.ə.s) gözəl əxlaq sahibi olması;

– Günah edən şəxs, peşman olub tövbə etsə belə, üzərində olan cərimə haqqı qüvvədən düşmür;

– Günah edən şəxsə başqası tərəfindən (onun əvəzinə) ödənilən cəri-mədən istifadə etməsi caizdir.

**Birinci fəsil: «Səfərdə tutulan oruc»**

191. Aişə (r.a) rəvayət edir ki, «Həmzə ibn Amr əl-Əsləmi (r.a) Peyğəmbərə (s.ə.s) dedi: "Səfərdə oruc tuta bilərəmmi?" Peyğəmbər (s.ə.s) cavabında ona belə dedi: "İstəyirsən tut, istəmirsənsə tutma!"» (əl-Buxari, 1943; Müslim, 2620).

---

[1] Başqa rəvayətdə: "Ramazan ayında zövcəmlə cinsi əlaqədə olmuşam".
[2] Günahının bağışlanması üçün cərimə ver.

191-ci hədisdən çıxarılan nəticələr:
– Səfərdə oruc tutmağın caiz olması;
– Səfərdə tutulan orucun ixtiyari olması. Belə ki, qüvvəsi çatan şəxsə səfərdə oruc tutmaq müstəhəbdir.

192. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) ilə səfərdə olduğumuz müddətdə oruc tutanlarla tutmayanlar buna görə biri-birini qınamaz və təqsirləndirməzdilər» (əl-Buxari, 1947; Müslim, 2615).

192-ci hədisdən çıxarılan nəticələr:
– Səfərdə oruc tutmağın və ya tutmamağın caiz olması;
– Peyğəmbərin (s.ə.s) onların bu əməlinə irad tutmaması.

193. Əbu-d-Dərdə (r.a) rəvayət edir ki, «Biz Peyğəmbər (s.ə.s) ilə bərabər Ramazan ayında şiddətli bir istidə səfərə çıxdıq. Bizim aramızda Peyğəmbər (s.ə.s) və Abdullah ibn Ravahədən (r.a) savayı oruc tutan yox idi» (əl-Buxari, 1945; Müslim, 2625).

193-cü hədisdən çıxarılan nəticələr:
– Səfərdə oruc tutmağın caiz olması;
– Şiddətli istidə oruc tutmağın caiz olması.

194. Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) səfərdə ikən taqətdən düşmüş bir kişinin ətrafına toplaşmış səhabələri görüb onlardan onun nə üçün bu hala düşməsi barəsində soruşdu. Onlar: "O, oruc tutub" – deyə cavab verdikdə, Peyğəmbər (s.ə.s) dedi: "Səfərdə oruc tutmaq xeyirxahlıqdan deyildir"» (əl-Buxari, 1946; Müslim, 2607).
Başqa rəvayətdə: «Allahın sizə rüxsət verdiyi əməldən möhkəm yapışın» (Müslim, 2609).

194-cü hədisdən çıxarılan nəticələr:
– Səfərdə tutulan orucun ixtiyari olması;
– Nəfsə zülm etməmək şərtilə səfərdə oruc tutmağın caiz olması. Əks halda tutulan oruc bəyənilmir, lakin oruc məqbul sayılır;
– Taqəti olmayan şəxsə səfərdə oruc tutmamağın daha əfzəl sayılması;
– Səfərin müddətində məhdudiyyətin olmaması.

195. Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) ilə bərabər səfərdə olduğumuz zaman aramızda oruc tutan və tutmayanlar var idi. Biz

az kölgəlik olan yerdə istirahət etmək üçün dayandıq. Oruc tutan qardaşlarının taqətdən düşüb susadıqlarını görən səhabələr onlar üçün çadır qurdular və onlara su içirtdilər. Bunu görən Peyğəmbər (s.ə.s) dedi: "Bu gün oruc tutmayanlar savab qazandılar"» (əl-Buxari, 2890; Müslim, 2617).

195-ci hədisdən çıxarılan nəticələr:
– Səfərdə tutulan orucun ixtiyari olması;
– Səhabələrin çətinlikdə də oruc tutmaları;
– Qardaşlara xidmət etməyin fəziləti;
– Səfərdə oruc tutmamağın daha əfzəl olması. Lakin bir şərtlə ki, bunun səbəbi olsun;
– İslam dininin insanları yalnız xeyirxah olmağa çağırması.

196. Aişə (r.a) rəvayət edir ki, «Mən Ramazan ayından qalan qəza oruclarını yalnız Şaban ayında tutardım» (əl-Buxari, 1950; Müslim, 2682).

196-cı hədisdən çıxarılan nəticələr:
– Qəzaya qalmış Ramazan orucunun icra edilməsini Şaban ayına qədər təxirə salmaq caizdir;
– Heç bir üzrlü səbəb olmadığı halda qəzaya qalmış orucları tez bir zamanda icra etmək daha əfzəldir;
– Qəzaya qalmış orucu növbəti Ramazan ayı daxil olana kimi təxirə salmaq bəyənilmir;
– Bu hədis Aişənin (r.a) Peyğəmbərlə (s.ə.s) gözəl əxlaqla davranmasına dəlalət edir.

197. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Orucu ödəməyib vəfat etmiş şəxsin yerinə onun vəlisi oruc tutmalıdır"» (əl-Buxari, 1952; Müslim, 2687).

197-ci hədisdən çıxarılan nəticələr:
– Vəfat etmiş şəxsin Allaha və ya insanlara olan borcunun ödənilməsi vacibdir;
Qeyd etmək lazımdır ki, başqa hədislər bu əməlin müstəhəb olmasına dəlalət edir. Bu da icmanın rəyinə müvafiqdir.
– Bu borcu ödəmək varislərdən birisinin öhdəsinə düşür.

198. Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Bir kişi gəlib Peyğəmbərə (s.ə.s) dedi: "Ey Allahın elçisi! Anam vəfat etmiş və boynunda bir ayın oruc haqqı qalmışdır. Mən onun yerinə bu orucu tuta bilərəmmi?"

Peyğəmbər (s.ə.s) dedi: "Ananın borcu qalmış olsa idi sən onu ödəyərdinmi?" Kişi: "Bəli" deyə cavab verdikdə, Peyğəmbər (s.ə.s) dedi: "Allahın borcunu ödəmək bundan da vacibdir"» (əl-Buxari, 1953; Müslim, 2689).

Başqa rəvayətdə: «Bir qadın gəlib Peyğəmbərə (s.ə.s) dedi: "Ey Allahın elçisi! Anam vəfat etmiş və boynunda nəzir orucunun haqqı qalmışdır. Mən onun əvəzinə bu orucu tuta bilərəmmi?" Peyğəmbər (s.ə.s) soruşdu: "Ananın borcu qalmış olsa idi sən onu ödəyərdinmi?" Qadın: "Bəli" – deyə cavab verdikdə, Peyğəmbər (s.ə.s) dedi: "Elə isə onun əvəzinə bu orucu tut"» (əl-Buxari, 1953; Müslim, 2688).

198-ci hədisdən çıxarılan nəticələr:
– Vəfat etmiş şəxsin əvəzinə vacib və ya nəzir orucunun tutulması;
– Vəfat etmiş şəxsin Allaha və ya insanlara olan borcunun ödənilməsi;
– Şəriət məsələlərində qiyas etməyin caiz olması;
– İlk növbədə Allahın haqqının ödənilməsinin vacibliyi.

199. Səhl ibn Səd əs-Saidi (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "İnsanlar iftarı tezləşdirmək[1] və səhuru gecikdirməklə[2] xeyrə nail olarlar"» (əl-Buxari, 1957; Müslim, 2549).

Qeyd: «və səhuru gecikdirməklə» ifadəsini Buxari və Müslim rəvayət etməmişlər. Belə ki, bu ifadə Əhmədin Müsnəd əsərində (5/146; 172) zəif sənədlə rəvayət olunmuşdur (Bax: «İrvau-l-Ğalil, 4/32, 917-ci hədisin çıxarışı).

199-cu hədisdən çıxarılan nəticələr:
– Günəş batan kimi iftar etməyin müstəhəb olması;
– İftarı tezləşdirməklə xeyrə nail olmaq;
– Peyğəmbərin (s.ə.s) sünnəsinə riayət etmək.

200. Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Gecənin buradan (məşriqdən) yaxınlaşdığı, gündüzün də buradan (məğribdən) uzaqlaşdığı zaman artıq oruc tutanın iftar etmək vaxtıdır"» (əl-Buxari, 1954; Müslim, 2553).

200-cü hədisdən çıxarılan nəticə:
– Günəş batan kimi iftar etməyin müstəhəb olması.

---
[1] Əvvəl vaxtında.
[2] Axır vaxtında

201. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) ardıcıl oruc tutmağı[1] qadağan etdi. Səhabələr: "Ey Allahın elçisi! Axı sən ardıcıl oruc tutursan!" – deyə ona müraciət etdikdə, o dedi: "Mənim halım sizin halınız kimi deyil. Mənə yemək-içmək (Rəbbim tərəfindən) verilir"» (əl-Buxari, 1962; Müslim, 2558).

Bu hədisi həmçinin Əbu Hüreyrə (r.a)[2], Aişə (r.a)[3] və Ənəs (r.a)[4] də rəvayət etmişlər.

202. Əbu Səid əl-Xudrinin (r.a) rəvayətində isə «Peyğəmbər (s.ə.s) dedi: "Sizdən biriniz ardıcıl oruc tutmaq istəsə, iftarı səhura qədər təxirə salsın"» (əl-Buxari, 1963).

201-ci və 202-ci hədislərdən çıxarılan nəticələr:

– Peyğəmbərə (s.ə.s) yemək-içmək verilməsi həqiqi mənasındadır;

– Ardıcıl oruc tutmağın hökmü

a) Bəzi islam alimlərinin rəyinə görə qüdrəti və qüvvəsi çatan şəxsə belə oruc tutmaq caizdir.

b) Əbu Hənifə, Malik və Şafiinin rəyinə görə belə oruc tutmaq haramdır. Onlar məhz bu hədisə əsaslanmışlar.

v) Əhmədin rəyinə görə, səhura qədər ardıcıl oruc tutmaq caiz, bunu tərk etmək isə əfzəldir. Bir neçə gün ardıcıl oruc tutmaq isə məkruhdur.

Bu rəylərin xülasəsi: Bir neçə gün ardıcıl oruc tutmaq haram, səhura qədər bunu etmək caiz, etməmək isə daha əfzəldir.

– Allah və Onun elçisinin, ümmətini zərər verən əməldən çəkindirməsi onlara qarşı rəhmli olmasına dəlalət edir;

– Şəriət hökmlərində mübaliğə etmək (onu şişirtmək) qadağandır. Belə ki, hər bir haqqı olanın haqqını ödəmək vacibdir;

– Ardıcıl oruc tutmaq yalnız Peyğəmbərə (s.ə.s) məxsusdur.

**İkinci fəsil: «Ən fəzilətli oruclar»**

203. Abdullah ibn Amr ibni-l-As (r.a) rəvayət edir ki, «Mənim: "Allaha and olsun ki, ölənə qədər gündüzləri oruc tutub, gecələri namaz qılacağam" dediyim Peyğəmbərə (s.ə.s) xəbər verildi və o dedi: "Bunu sən demisən?".

[1] Yəni iki və daha çox ardıcıl günlərdə yemək yemədən və su içmədən oruc tutmaq.
[2] Müslim, 2561.
[3] əl-Buxari, 1964; Müslim, 2567.
[4] əl-Buxari, 1961; Müslim, 2566.

Mən "Bəli, mən demişəm" – deyə cavab verdikdə o dedi: "Sən bunu bacarmayacaqsan. Elə isə həm oruc tut, həm də yemək ye, həm namaz qıl, həm də dincəl. Hər ayın üç gününü oruc tut. Həqiqətən bir əməlin savabı on həsənətə (savaba) bərabərdir. Belə etsən, bir ilin orucunu tutmuş hesab olunarsan". Mən: "Bundan əfzəlini etməyə taqətim çatar" – dedikdə o dedi: "(İki gün buraxmaqla) bir gün oruc tut!" Mən yenə: "Bundan əfzəlini etməyə taqətim çatar" – dedikdə o dedi: "Günaşırı oruc tut. Bu ən əfzəl sayılan Davudun (ə.s) orucudur". Mən bir daha: "Bundan əfzəlini etməyə taqətim çatar" – dedikdə o dedi: "Bundan əfzəl oruc yoxdur"» (əl-Buxari, 1979; Müslim, 2721).

Başqa rəvayətdə: «Qardaşım Davudun (ə.s) il boyu tutduğu orucdan əfzəl oruc yoxdur. Elə isə günaşırı oruc tut!» (əl-Buxari, 1980).

203-cü hədisdən çıxarılan nəticələr:

– Abdullah ibn Amr ibni-l-Asın (r.a) savaba nail olmaq üçün çalışması;

– Peyğəmbərin (s.ə.s) bu səhabəyə qayğıkeşlik göstərməsi;

– Davudun (ə.s) tutduğu orucun əfzəl oruc hesab olunması;

– Peyğəmbərin (s.ə.s) səhabəsinin nəyə qadir olduğunu bilməsi;

– İl boyu fasiləsiz oruc tutmağın məkruh olması;

– İslam dinində olan hökmlərin asanlıqla, mübaliğə etmədən yerinə yetirilməsi.

204. Abdullah ibn Amr ibni-l-As (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Allah üçün ən sevimli olan oruc Davudun (ə.s) tutduğu orucdur və ən sevimli namaz da onun qıldığı namazdır. O gecənin yarısını yatar, sonra qalxıb üçdə birini namaz qılar, sonra da onun altıda birini yenə yatardı. Orucu isə günaşırı tutardı"» (Müslim, 2731).

204-cü hədisdən çıxarılan nəticələr:

– Günaşırı tutulan orucun ən fəzilətli oruc sayılması;

– Gecənin yarısını yatıb, sonra üçdə birini namaz qılmaq və yenə altıda birini yatmaq ən əfzəl qiyam (gecə qılınan namaz) sayılır;

– İbadətdə mübaliğə etməmək;

– Allah üçün olan ibadətlər müxtəlifdir. Elə isə hər bir ibadəti öz vaxtında yerinə yetirmək vacibdir.

205. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) mənə üç şeyi – hər ayın üç gününü oruc tutmağı, iki rükət Düha namazı və bir də yatmamışdan əvvəl Vitr namazını qılmağı nəsihət etdi"» (əl-Buxari, 1981; Müslim, 1669).

205-ci hədisdən çıxarılan nəticələr:

– hər ayın üç gününü oruc tutmağın əfzəl olması. Xüsusən də «Beyd»[1] günlərini oruc tutmaq sünnətdəndir;

– İki rükət Düha və yatmamışdan əvvəl Vitr namazı qılmağın əfzəl olması.

206. Məhəmməd ibn Abbad ibn Cəfər deyir ki, «Mən Cabir ibn Abdullahdan (r.a): "Peyğəmbər (s.ə.s) cümə günü oruc tutmağı qadağan edibmi?" – deyə soruşduqda, o: "Bəli" – deyə cavab verdi» (əl-Buxari, 1974; Müslim, 2676).

207. Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin (s.ə.s) "Heç kəs cümə günü oruc tutmasın! (Cümə günü oruc tutmaq istəyən) ondan əvvəlki, ya da ondan sonrakı günü də oruc tutsun!"» (əl-Buxari, 1975; Müslim, 2678).

206-cı və 207-ci hədislərdən çıxarılan nəticələr:

– Cümə günü oruc tutmağın qadağan olunması;

– Ondan bir gün qabaq və ya sonra olan günlə bərabər cümə günü oruc tutmağın caiz olması.

208. İbn Əzharın mövlası Əbu Übeyd[2] (r.a) rəvayət edir ki, «Mən Ömər ibnu-l-Xəttabla (r.a) bayram günündə (bayram namazı xütbəsində) iştirak etdim. O dedi: "Peyğəmbər (s.ə.s) bu günlərdə – Fitrə və Qurban bayramlarında – oruc tutmağı qadağan etmişdir"» (əl-Buxari, 1990; Müslim, 2666).

208-ci hədisdən çıxarılan nəticələr:

– Fitrə və Qurban bayramlarında oruc tutmağın haram sayılması;

– Qəza orucunu belə bu günlərdə tutmağın caiz olmaması;

– Zaman və məqama münasib xütbə verməyin müstəhəb olması.

209. Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) bayram[3] günlərində oruc tutmağı, ihtiba və samməni, bir də Sübh və Əsrdən sonra namaz qılmağı qadağan etdi"» (əl-Buxari, 1991, 1992; Müslim, 5466).

---

[1] Qəməri təqvimlə hər ayın 13-ü, 14-ü və 15-i.

[2] Adı: Səd ibn Übeyd.

[3] Fitrə və Qurban bayramları.

İhtiba: Ayaqları yan tərəfə çəkməklə yan (arxası) üstə oturmaq və onun (ayaqların) üzərinə bir örtük örtməkdir.

Sammə: Bunun iki mənası var:

1) Dilçilərin rəyinə görə, bu, parçanı sağ tərəfdən gətirib sol çiyin və qol nahiyəsini örtmək, sonra da arxadan gətirib sağ çiyin və qol nahiyəsini örtməkdir. Bu halda qolların çıxıntısı üçün dəlik qalmır.

Qeyd: Dilçilərin rəyinə görə, sammə bəyənilmir (məkruhdur). Çünki bu halda namaz qılmaq çox çətindir.

2) Fəqihlərin rəyinə görə isə, bu, parçaya bürünüb sonra onun hər hansı bir tərəfini qaldırıb çiyin üzərinə qoymaqdır ki, bu halda övrət yeri açıq qalır.

Qeyd: Fəqihlərin rəyinə görə sammə haramdır. Çünki bu halda övrət yeri açıq qalır.

209-cu hədisdən çıxarılan nəticələr:

– Hədisdə qadağan olunanlardan çəkinmək;
– Bayram günlərində oruc tutmağın qadağan olması;
– Sübh və əsr namazlarından sonra namaz qılmağın qadağan olması;
– İhtiba və sammənın məkruh olması. Lakin bu hallarda övrət yeri açılarsa, bunu etmək haram sayılır;
– Şəriət insanların vəziyyətini nəzərə almış və onlara münasib hökmlər təyin etmişdir.

210. Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Allah, Onun yolunda (cihadda) bir gün oruc tutanı yetmiş payız (yetmiş illik məsafə qədər) oddan (Cəhənnəmdən) uzaqlaşdırar"» (əl-Buxari, 2840; Müslim, 2704).

210-cu hədisdən çıxarılan nəticələr:

– Cihadda oruc tutmağın fəziləti;
– Müstəqil (cihada getmədən) oruc tutmağın müstəhəb sayılması;
– Cəhənnəm odundan uzaqlaşmaqla Cənnət nemətlərinə yaxınlaşmaq;
– «İl» kəlməsini «payız»la ifadə etməyin caiz olması.

**Üçüncü fəsil: «Qədr gecəsi»**

211. Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Bir dəstə kişi Qədr gecəsinin Ramazan ayının axır yeddi gecəyə təsadüf olunduğunu röyalarında gördülər. Peyğəmbər (s.ə.s) onlara dedi: "Röyalarınızın bir-

birinə müvafiq olduğu artıq mənə bəllidir. Elə isə axır yeddi gecədə onəu tapmaq üçün səy göstərin"» (əl-Buxari, 2015; Müslim, 2753).

212. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) dedi: "Ramazanın axır on gününün tək günlərində Qədr gecəsini tapmaq üçün səy göstərin!"» (əl-Buxari, 2017; Müslim, 2755, 2759).

211-ci və 212-ci hədislərdən çıxarılan nəticələr:

– Qədr gecəsinin fəziləti. Bu gecədə bir çox hadisələr baş verir ki, bu da onun üstünlüyünə dəlalət edir. Belə ki, Quranın bu gecədə nazil olması, həmçinin mələklərin də hər il bu gecədə nazil olması və bir illik qədərin yazılması da buna misaldır.

– Bu gecələrdə ibadətləri artırmaq (xüsusən də Quran oxumaq) müstəhəbdir;

– Allah tərəfindən olan röyanın həqiqət olması.

213. Əbu səid əl-Xudri (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) Ramazan ayının orta on gününü[1] (məsciddə) etikaf[2] edərdi. Bir dəfə o, Ramazan ayının iyirmi birinci gecəsində – yəni səhərisi etikafdan çıxdığı gecə dedi: "Mənimlə etikaf edənlər axır on günü də etikaf etsinlər! Artıq o gecə mənə göstərildi, sonra isə unutduruldu (yadımdan çıxdı). O gecənin səhəri su və gil üzərinə səcdə etdiyimi gördüm. Elə isə o gecəni, (Ramazan ayının) axır on gününün tək günlərində tapmağa səy göstərin".

Əbu Səid (r.a) deyir ki: «O gecə bərk yağış yağdı. Məscid ağac, küləş və şaxdan tikildiyi üçün yağış suyu onun içərisinə daxil oldu. O gecənin səhəri, mən Peyğəmbərin (s.ə.s) alnının suya və palçığa batdığını öz gözümlə gördüm» (əl-Buxari, 2016; Müslim, 2761).

213-cü hədisdən çıxarılan nəticələr:

– Peyğəmbərin (s.ə.s) Ramazan ayının orta on gününü etikaf etməsi yalnız ona görə idi ki, o, Qədr gecəsinin axır on günə təsadüf olunduğundan xəbərsiz idi;

– Qədr gecəsinin tək sayda olan gecələrə təsadüf etməsi;

– Peyğəmbərin (s.ə.s) röyalarının həqiqət olması;

– Peyğəmbər (s.ə.s) məscidinin vəsf olunması.

---

[1] Ayın 10-dan 20-dək.

[2] Allaha ibadət məqsədilə bir müddət məsciddə qalmaq.

**Dördüncü fəsil: «Etikaf»**

214. Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər (s.ə.s) vəfat edənə qədər Ramazan ayının axır on günlərini etikaf edərdi. Onun vəfatından sonra isə zövcələri etikaf edərdilər» (əl-Buxari, 2026; Müslim, 2776).

Başqa rəvayətdə: «Peyğəmbər (s.ə.s) Ramazan aylarında etikaf edərdi. O, hər dəfə sübh namazını qılar, sonra da etikaf etdiyi yerə gedərdi» (əl-Buxari, 2041).

214-cü hədisdən çıxarılan nəticələr:

– Etikafın Peyğəmbərin (s.ə.s) sünnəsindən olması;
– Etikafın dünya və axirətdə olan səmərəsi;
– Etikafı ramazan ayının axır on günündə etməyin əfzəl olması;
– Qadınlara etikaf etməyin caiz olması;
– Sübh namazından sonra etikaf olunan yerdə olmaq;
– Etikaf üçün müəyyən bir yer tutmağın caiz olması;
– Etikafda olan müddətdə cinsi əlaqəyə girməyin qadağan olması. Habelə, səbəbsiz məsciddən çıxmaq və dünyəvi işlərlə məşğul olmaq da buna aiddir.

215. Aişə (r.a) rəvayət edir ki, «O, heyzli olduğu halda Peyğəmbərin (s.ə.s) saçını darayardı. O anda Peyğəmbər (s.ə.s) məsciddə etikafda olduğu üçün başını Aişənin (r.a) komasına tərəf uzadardı» (əl-Buxari, 2028; Müslim, 684).

Başqa rəvayətdə: «Peyğəmbər (s.ə.s) ehtiyacı olmadan səbəbsiz yerə (etikafdan çıxıb) evə daxil olmazdı» (əl-Buxari, 2029; Müslim, 683).

Başqa bir rəvayətdə Aişə (r.a) deyir ki, "Həqiqətən mən yalnız ehtiyacım olduqda evə daxil olardım. Hətta evdə olan xəstəyə belə ayaqüstü baş çəkərdim» (Müslim, 683).

215-ci hədisdən çıxarılan nəticələr:

– Etikafda olan müddətdə saça qulluq etməyin caiz olması;
– Heyzli qadınla ünsiyyətdə olmağın caiz olması;
– Etikafın yalnız məsciddə icra olunması;
– Yalnız ehtiyac üzündən məsciddən çıxmağın caiz olması;
– Bədənin bir hissəsini məsciddən bayıra çıxarmaq isə buna aid deyil;
– Heyzli qadının məscidə daxil olmaması;
– Ehtiyac üzündən məsciddən çıxanın tez bir zamanda qayıtması;
– Etikafda olan müddətdə qadına şəhvət hissi olmadan toxunmağın caiz olması.

216. Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, «Mən cahillik dövründə Məscidülhəramda bir gecə etikafda olmağı nəzir etmişəm» – deyə nə edəcəyimi Peyğəmbərdən (s.ə.s) soruşduqda, o (s.ə.s) dedi: «Nəzirini yerinə yetir!» (əl-Buxari, 2043; Müslim, 4268).

216-cı hədisdən çıxarılan nəticələr:
– İslamı qəbul etdikdən sonra belə nəzirin yerinə yetirilməsinin vacib olması;
– Etikaf etmək müstəhəbdir, lakin nəzir olunduqda vacib hökmündə olur.

217. Səfiyyə bint Huyey (r.a) rəvayət edir ki, «Bir gecə Peyğəmbər (s.ə.s) etikafda olduğu vaxt onu ziyarət etdim. Bir müddət onunla söhbət etdim. Sonra qalxıb evə qayıtmaq istədikdə o da mənimlə (məni ötürmək üçün) qalxdı. Ummu Sələmənin (r.a) qapısının önünə çatdıqda ənsarlardan olan iki kişi salam verib bizim yanımızdan keçdi. Peyğəmbər (s.ə.s) onlara: "Dayanın! Bu Səfiyyə bint Hüyeydir" deyə müraciət etdikdə, onlar təəccüblə: "Sübhanəllah, ya rəsulullah!" – deyə cavab verdilər. Peyğəmbər (s.ə.s) onlara dedi: "Həqiqətən, şeytan Adəm övladının qan damarına belə daxil olur. Belə ki, qəlbinizə şər (şəkk-şübhə, pis fikir) salmağından qorxdum"» (əl-Buxari, 2035).
Başqa rəvayətdə: «Peyğəmbər (s.ə.s) Ramazanın axır on gününü etikaf etdikdə Səfiyyə (r.a) onu ziyarət etdi…»

217-ci hədisdən çıxarılan nəticələr:
– Ramazan ayının axır on gününü etikaf etməyin əfzəl olması;
– Etikafda məsləhət üçün bir müddət söhbət etməyin caiz olması;
– Lətafətli və gözəl əxlaqlı olmaq;
– Alicənab olmaq;
– İttiham olunmaqdan qorunmaq;
– Şeytanın daima insanla olması;
– Hakimin mühakimə olunana hökmün məğzini bəyan etməsi;
– Etikaf edənə zövcəsi ilə təkliyə çəkilib söhbət etməyin caiz olması.

***<u>Xülasə</u>***

Təzə ayın görünməsi ilə orucluğun başlanması və bitməsi.
Orucun ərkanları:
– Oruc tutmaq üçün niyyət etmək;

– Dan yeri ağarandan gün batana qədər qadağan olunmuş şeylərdən (yemək, içmək, cinsi əlaqə və s.) çəkinmək.

Oruc hər bir həddi-büluğa çatmış, ağlı başında olan və taqəti çatan müsəlmana vacibdir.

Müsafir və xəstələr müstəsnadır.

Hamilə və süd verən qadınlar da müstəsnadır.

Heyz və nifas halında oruc tutmaq isə haramdır.

Oruc zamanı bəyənilən əməllər:

– Səhur (dan yeri ağarmamışdan əvvəlki yeyib-içmək);
– Səhuru təxirə salmaq (dan yeri ağarana yaxın etmək);
– İftarı tezləşdirmək;
– Xurma və ya su ilə iftar etmək;
– İftardan öncə dua etmək;
– Söyüş söyənə, təhqir edənə məhəl qoymamaq;
– Dişləri misvakla təmizləmək;
– Çoxlu Quran oxumaq;
– Ramazanın axır on gününü etikaf etmək;
– Bu günlərdə ibadəti artırmaq;
– Oruc tutanlara iftar yeməyi vermək.

Orucu batil edən amillər:

– Qəsdən qusmaq;
– Qəsdlə yemək, içmək və cinsi əlaqədə olmaq;
– Dərman içmək və ya qidalandırıcı iynələrdən (qlükoza və s.) istifadə etmək;
– Heyz və nifas halına düşmək;
– Qəsdlə məni ifraz etmək. Yuxuda və xəstəlik nəticəsində ifraz olunan məni isə müstəsnadır.

## BƏ’Zİ ƏRƏB SÖZLƏRİNİN İZAHI

| | |
|---|---|
| Abid | – İbadət edən şəxs. |
| Vadi | – Dərə. |
| Qiblə | – Müqəddəs Kə’bəyə olan istiqamət. |
| Dəccal | – Qiyamətə yaxın Allahlıq və ya peyğəmbərlik iddiasında olan yalançı məsih. |
| Ənsar | – Peyğəmbərin (s.ə.s) zamanında yaşayan və dini uğrunda öz yerlərindən hicrət edənləri qəbul edən Mədinə şəhərinin sakinləri. |
| Əcr | – Savab. |
| Zahid | – Tərkidünya |
| Zəkat | – Lüğəti mə’nası: artmaq, çoxalmaq.<br>İstilahi mə’nası: tə’yin olunmuş miqdara çatmış, mə’lum olan vaxtda (ilin tamamında və ya məhsul yığımı zamanı) səkkiz sinif insanlar üçün ayrılan mal. |
| İstilah | – Sözün şəriət baxımından şərhi. |
| İstihazə | – Qadından adəti üzrə hər ayın müəyyən günlərində gələn qandan əlavə günlərdə gələn qan. |
| Yə’cuc və Mə’cuc | – Qiyamətə yaxın bir vaxtda peyda olan iki tayfanın adıdır. |
| Kə’bə | – Məkkə şəhərində yerləşən Allahın müqəddəs evi. |
| Künyə | – Ad və ləqəbdən başqa hər hansı şəxsə verilən xüsusi əlamət. |
| Mədinə | – Peyğəmbərin (s.ə.s) şəhəri. |
| Məzlum | – Zülm olunan. |
| Moizə | – Çıxış etmək, mühazirə söyləmək. |
| Mütaliə | – oxumaq. |
| Namaz | – Lüğəti mə’nası: dua.<br>İstilahi mə’nası: Təkbirlə (Allahu Əkbər deməklə) başlayıb təslimlə (salam verməklə) bitən, xüsusi kəlmələrdən və hərəkətlərdən ibarət olan ibadət. |
| Oruc | – Lüğəti mə’nası: pəhriz (nəfsi saxlamaq).<br>İstilahi mə’nası: Dan yeri ağarandan gün batana qədər qadağan olmuş şeylərdən (yemək, içmək, cinsi əlaqədə olmaq və s.) çəkinmək. |
| Pollüsiya | – Yuxuda olarkən məni (sperma) ifraz etmək. |
| Səhabə | – Peyğəmbər (s.ə.s) ilə sağlığında görüşmüş, ona iman gətirmiş və mö’min olaraq vəfat etmiş şəxs. |
| Tabiin | – Səhabə ilə sağlığında görüşmüş, islamı qəbul etmiş və mö’min olaraq vəfat etmiş şəxs. |
| Təqlid | – Yamsılama, oxşatma, bənzətmə. |
| Təharət | – Təmizlənmək, paklanmaq. |
| Təşəhhüd | – Namazın ikinci və sonuncu rükətlərində oturaq vəziyyətdə oxunan dua. |
| Titul | – Fəxri ad. |

| | |
|---|---|
| Ümrə | – İbadət məqsədilə istənilən vaxt müqəddəs Kə'bəni ziyarət etmək. |
| Fardul-ayn | – Namaz, oruc və b. kimi hər bir müsəlman şəxsin üzərinə düşən vacib əməl |
| Fardul-kifayə | – Bir və ya daha çox müsəlmanların yerinə yetirməsi ilə digərləri üçün vacib olmayan əməl. |
| Fəth | – Zəfər, qələbə, açılış. |
| Həcc | – İbadət məqsədilə ilin müəyyən vaxtında Məkkəni ziyarət etmək. |

# M Ü N D Ə R İ C A T